QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

Aprel 2016
04 (1077)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ




## "Açıq hökumətin təşviqinə dair 2016-2018-ci illər üçün Milli Fəaliyyət Planı"nın təsdiq edilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, açıq hökumət prinsiplərinin tətbiqinin genişləndirilməsi, korrupsiyanın qarşısının alınması üzrə yeni mexanizmlərin tətbiqi, vətəndaş cəmiyyəti institutlarının fəaliyyətinin və ictimai nəzarətin gücləndirilməsi, sahibkarların hüquqlarının müdafiəsi, "Açıq hökumətin təşviqinə dair 2012-2015-ci illər üçün Milli Fəaliyyət Planı" və "Korrupsiyaya qarşı mübarizəyə dair 2012-2015-ci illər üçün Milli Fəaliyyət Planı" çərçivəsində həyata keçirilən tədbirlərin davamlılığının təmin edilməsi məqsədi ilə qərara alıram:

1. "Açıq hökumətin təşviqinə dair 2016-2018-ci illər üçün Milli Fəaliyyət Planı" təsdiq edilsin.

2. Mərkəzi və yerli icra hakimiyyəti orqanları:

2.1. "Açıq hökumətin təşviqinə dair 2016-2018-ci illər üçün Milli Fəaliyyət Planı"nda (bundan sonra - Fəaliyyət Planı) nəzərdə tutulan tədbirlərin icrası barədə hər il dekabrın 30-dək Azərbaycan Respublikasının Nazirlər Kabinetinə və Azərbaycan Respublikasının Korrupsiyaya qarşı mübarizə üzrə Komissiyasına illik hesabatlarını təqdim etsinlər;

2.2. Fəaliyyət Planının icrası üzrə illik iş planlarını təsdiq etsinlər və bu barədə məlumatı Azərbaycan Respublikasının Korrupsiyaya qarşı mübarizə üzrə Komissiyasına elektron qaydada versinlər.

3. Azərbaycan Respublikasının Nazirlər Kabinetinə tapşırılsın və Azərbaycan Respublikasının Korrupsiyaya qarşı mübarizə üzrə Komissiyasına tövsiyə edilsin ki, Fəaliyyət Planının yerinə yetirilməsi ilə əlaqədar görülən işlərin vəziyyətini mütəmadi təhlil etsinlər və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versinlər.

4. Azərbaycan Respublikasının Hesablama Palatasına, Baş Prokurorluğuna, İnsan Hüquqları üzrə Müvəkkilinə (Ombudsmana), Məhkəmə-Hüquq Şurasına, Azərbaycan Respublikasının məhkəmələrinə, yerli özünüidarəetmə orqanlarına tövsiyə olunsun ki, Fəaliyyət Planında nəzərdə tutulan tədbirlərin icrasını təmin etsinlər.

5. Azərbaycan Respublikasının Korrupsiyaya qarşı mübarizə üzrə Komissiyasına tövsiyə edilsin ki, Fəaliyyət Planının icrasının dəyərləndirilməsi prosesinə vətəndaş cəmiyyəti institutlarının cəlb edilməsi üçün tədbirlər görsün və həmin planın həyata keçirilməsi sahəsində görülən işlər barədə ictimaiyyətə mütəmadi olaraq məlumat versin.

6. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 27 aprel 2016-cı il*

# ADPU-da orduya dəstək aksiyası keçirilib

Aprel ayının 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) universitet rəhbərliyinin, professor-müəllim heyətinin və tələbə kollektivinin iştirakı ilə Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə bağlı son günlər cəbhə bölgəsində yaranmış vəziyyətlə əlaqədar orduya dəstək aksiyası keçirilib. Aksiyada ilk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, sonra isə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Təhlükəsizlik Şurasının aprel ayının 2-də keçirilən iclasında etdiyi çıxışdan bəzi məqamlar səsləndirilib. Daha sonra isə cəbhə bölgəsində həlak olmuş soydaşlarımızın xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov dəstək aksiyasını giriş sözü ilə açaraq aprel ayının 1-dən-2-nə keçən gecədən başlayaraq işğalçı Ermənistan Azərbaycana qarşı növbəti silahlı təxribata başlayıb. Bu təxribat hazırda da davam edir. Ermənistan hərbi qüvvələri Azərbaycan kəndlərini, yaşayış məntəqələrini atəşə tutur və hərbi mövqelərimizə ardıcıl zərbələr endirir. Ermənistan silahlı qüvvələrinin atəşkəs rejimini pozaraq silahlı təxribatlara əl atması nəticəsində hərbiçilər və eləcə də dinc mülki əhali həlak olur, vətəndaşlara maddi-mənəvi ziyan dəyir. Azərbaycan Silahlı Qüvvələri ölkə vətəndaşlarının təhlükəsizliyini və öz mövqelərini qorumaq üçün erməni silahlı qüvvələrinə layiqli cavab verərək, onları geri otuzdurub və genişmiqyaslı hücum əməliyyatları həyata keçirib. ATƏT-in Minsk Qrupuna həmsədrlik edən ölkələrin dövlət başçılarının və digər beynəlxalq təşkilatların atəşkəsin yenidən təmin edilməsi çağırışlarına cavab olaraq Azərbaycan hücumları birtərəfli qaydada dayandırıb. Lakin təcavüzkar Ermənistan atəşkəs çağırışlarına məhəl qoymadan ağır sialhlarla Azərbaycanın mövqelərinə atəş açmaqda davam edir. Azərbaycan da öz növbəsində bu təxribatlara cavab olaraq adekvat addımlar atır. Hazırda düşmən ordusu təşviş içindədir və çıxış yolunu qaçmaqda görür. Qürur duyuruq ki, Azərbaycan Silahlı Qüvvələrinin qətiyyətli əks-hücumu ilə erməni qəsbkarları geri çəkilməyə məcbur edilmiş, düşmən canlı qüvvə və hərbi texnika sarıdan xeyli itki vermişdir. Azərbaycan Ordusu cəbhə bölgəsində əməliyyat şəraitinə nəzarət edir. Xüsusi qeyd etmək istəyirəm ki, döyüş əhval-ruhiyyəsi çox yüksək olan ordumuz hər an düşmənə layiqli cavab verməyə hazırdır. Eyni zamanda Azərbaycan Silahlı Qüvvələrinin son günlər ön cəbhədə qazandığı uğurlar xalqımızda böyük ruh yüksəkliyi yaratmış, onun qələbəyə inam hissini daha da gücləndirmişdir. Azərbaycanın artan iqtisadi, siyasi və hərbi üstünlüyü bir daha özünü açıq-aşkar göstərdi. Son günlər cəbhədə yaranmış vəziyyətlə əlaqədar Azərbaycan yüksək səviyyədə beynəlxalq siyasi dəstək almışdır. Bu da ölkə rəhbərliyinin yürütdüyü müstəqil və uzaqgörən xarici siyasətinin məntiqi nəticəsi kimi qiymətləndirilir.






Dəstək aksiyasında Filologiya fakültəsinin dekanı, filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilov, Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru, professor Şəhla Əliyeva, həmin fakültənin tələbəsi Mehmet Demirhan, Biologiya fakültəsinin tələbəsi Xoşqədəm Həsənli, Riyaziyyat və informatika fakültəsinin tələbəsi Aytac Fərzəliyeva, Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsinin tələbəsi Turan Kərimli çıxış edərək ermənilərin son təxribatçı hərəkətlərini qətiyyətlə pisləyərək ölkə Prezidenti, Ali Baş Komandan İlham Əliyevin ətrafında sıx birləşdiklərini və Vətənimizi erməni işğalçılarından hər an azad etməyə hazır olduqlarını bildiriblər.

Aksiyada tələbə-gənclər "Qarabağ bizimdir!", "Qansa qan! cansa can! Təki sən yaşa, Azərbaycan!", "Ayrılarmı könül candan? Azərbaycan-Türkiyə!", "Şəhidlər ölməz, Vətən bölünməz!", "Azərbaycan bayrağını Qarabağdan asacağıq!", "Ya Qarabağ, ya ölüm! Başqa yolu yox!", "Vətən sağ olsun!", "Əmrini gözləyirik, cənab Ali Baş Komandan!", "Yaşasın qüdrətli Azərbaycan Ordusu!" şuarlarını səsləndirərək orduya dəstək veriblər.

Aksiyada Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevə müraciət qəbul edilib. Tədbir "Koroğlu" uvertürasının səsləndirilməsi ilə başa çatıb. Qeyd edək ki, həmin gün ADPU-nun 7 filialında - Quba, Zaqatala, Şəki, Şamaxı, Qazax, Ağcəbədi və Cəlilabad filiallarında da orduya dəstək məqsədilə aksiyalar keçirilib.

**Mənsur İbrahimli**

# “Ədalətin bərqərar olunması və böyük fəlakətin qarşısının alınması naminə” petisiya layihəsi çərçivəsində tədbir

Aprel ayının 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Azərbaycanda Vətəndaş Cəmiyyətinin İn-



kişafına Yardım Assosiasiyasının (AVCİYA) “Ədalətin bərqərar olunması və böyük fəlakətin qarşısının alınması naminə” petisiya layihəsi çərçivəsində tədbir keçirilib. Tədbirdə ilk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov tədbiri giriş sözü ilə açaraq bildirib ki, vətəndaş cəmiyyəti institutunun təmsilçiləri-qeyri-hökumət təşkilatları, ictimai birliklər Azərbaycan həqiqətlərinin, xüsusilə də, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə bağlı həqiqətlərin dünya ictimaiyyətinə çatdırılmasında fəal iştirak edirlər. Son günlər Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan möhtərəm cənab İlham Əliyevin rəhbərliyi ilə ordumuz növbəti erməni təxribatına layiqli cavab verib. Nəticədə erməni qəsbkarları geri çəkilməyə məcbur edilib, düşmən canlı qüvvə və hərbi texnika sarıdan xeyli itki verib. Qoşunların təmas xəttində baş verən məlum hadisələrlə bağlı BMT, ATƏT, AŞ, NATO, Aİ, İƏT, eləcə də 40-a yaxın ölkənin rəhbəri bəyanatlarla çıxış ediblər. Bu bəyanatların hamısında Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin yalnız sülh yolu ilə həll oluna biləcəyi öz əksini tapıb. Hazırda informasiya müharibəsi gedir və biz bu müharibəni də uğurla aparmalıyıq. Bu baxımdan, AVCİYA-nın hazırda işğalçı Ermənistanın Azərbaycana qarşı təcavüzünün beynəlxalq aləmdə ifşa edilməsi məqsədilə həyata keçirdiyi “Ədalətin bərqərar olunması və böyük fəlakətin qarısının alınması naminə” petisiya layihəsi mühüm əhəmiyyət kəsb edir. Milli Məclisin deputatı, AVCİYA-nın prezidenti Elxan Süleymanovun imzası ilə ABŞ prezidenti Barak Obamanın Administrasiyasına petisiya ilə müraciət edilib. Layihə işğalla bağlı hərbi mübarizənin intellektual mübarizədə davamıdır. Tələbə-gənclər bu petisiyada fəal iştirak etməli, Azərbaycanın haqq səsinin dünya ictimaiyyətinə çatdırılmasına dəstək verməlidirlər.

Millət vəkili Elxan Süleymanov görüşdə çıxış edərək deyib ki, ilk dəfə olaraq Azərbaycanın Dağlıq Qarabağ və digər ərazilərinin Ermənistan dövləti tərəfindən işğal edilməsi faktı Avropa Şurası Parlament Assambleyasının (AŞPA) 2085 saylı (2016) qətnaməsində öz əksini tapıb.





Qətnamədə Ermənistan silahlı qüvvələrinin işğal bölgəsindən dərhal geri çəkilməsi tələbi də qeyd edilib. Qətnamədə həm də Ermənistanın Azərbaycana qarşı törətdiyi ekoloji böhran və Sərhəng su anbarının hazırkı vəziyyətinin humanitar fəlakətlə nəticələnəcəyi vurğulanır. Eyni zamanda qətnamədə ATƏT-in Minsk Qrupunun torpaqlarımızın işğaldan azad edilməsində heç bir nəticə əldə etmədiyi də qeyd edilir.

AŞPA mühüm tarixi əhəmiyyət kəsb edən bu qətnaməsi ilə ilk dəfə olaraq Ermənistan silahlı qüvvələrinin Azərbaycan ərazilərini işğal etdiyini bildirir və erməni qoşunlarının bu ərazilərdən çıxarılmasını tələb edir. AVCİYA-nın “Ədalətin bərqərar olunması və böyük fəlakətin qarşısının alınması naminə” petisiya layihəsi də məhz bu qətnaməyə ABŞ-ın dəstək verməsi üçün həyata keçirilir. Petisiya vasitəsilə AŞ-nın 46 ölkəsinin səs verdiyi qətnamə Ağ Evin saytında dünyaya çatdırılacaq. Petisiyaya 100 min nəfərin səs verməsi lazımdır. Artıq petisiyaya səs verənlərin sayı 100 mini keçib. 1 ay davam edəcək petisiyada 13 yaşdan yuxarı hər bir şəxs iştirak edə bilər. (Son məlumatlara görə, petisiyaya qosulanların sayı artıq 327 min nəfəri keçib və petisiya uğurla davam edir - müəllif) Qeyd edək ki, AVCİYA bütün dünya azərbaycanlılarının, eləcə də Türk dünyasının bu petisiya barədə məlumatlandırılması üçün geniş təbliğat kampaniyasına başlayıb.

Tədbirdə petisiya ilə bağlı videoçarx nümayiş etdirilib və tələbəgənclərə səsvermənin qaydaları haqqında ətraflı məlumat verilib.

**Gülnar Süleymanova**

# Elmi Şuranın iclası keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının aprel ayının 15-də keçirilən iclasının gündəliyinə aşağıdakı məsələlər daxil idi: ADPU-nun yeni Nizamnaməsinin və filiallarının Əsasnaməsinin müzakirəsi; Tədrisin Təşkili və İdarəedilməsi Mərkəzinin yaradılması barədə; 2015-2016-cı tədris ilinin yaz-yay imtahan sessiyalarına hazırlığın vəziyyəti; Universitetin dövri elmi jurnallarının nəşri və fakültələrdə elmi seminarların təşkili barədə; İbtidai təhsil fakültəsinin fəaliyyəti haqqında hesabat; Pedaqoji



təcrübənin yoxlanılması üçün yaradılmış Monitorinq Qrupunun hesabatı; SABAH qrupunun hesabatı; Cari məsələlər; Elmi-tədqiqat laboratoriyasına rəhbər, kiçik elmi işçi və kafedralar üzrə dosent vəzifələrinə seçkilər.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Elmi Şuranın sədri, professor Yusif Məmmədov iclası giriş sözü ilə açıb. Rektor Yusif Məmmədov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu filialları ilə birlikdə ADPU-ya qoşulub. Həmçinin Nazirlər Kabinetinin 3 fevral 2016-cı il tarixli qərarı ilə isə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə qoşularaq, sonuncu Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərməyə başlayıb. Baş verən bu struktur dəyişiklikləri nəticəsində ADPU-nun yeni Nizamnaməsinin və filiallarının Əsasnaməsinin müzakirə edilib qəbul olunması zərurəti yaranıb. Bu məqsədlə yaradılmış işçi heyət səmərəli fəaliyyət göstərərək universitetin yeni Nizamnaməsini və filiallarının Əsasnaməsini işləyib hazırlayıb.

Elmi Şura üzvləri ADPU-nun yeni Nizamnaməsini və filiallarının Əsasnaməsini müzakirə edərək yekdilliklə qəbul ediblər.

“Tədrisin Təşkili və İdarəedilməsi Mərkəzinin yaradılması barədə” ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov çıxış edib. Prorektor M.Cəbrayılov bildirib ki, son vaxtlar ADPU-nun fəaliyyət dairəsi genişlənib. Bu da öz növbəsində idarəetmənin daha çevik və səmərəli qurulmasını tələb edir. Buna görə də universitetdə Tədrisin Təşkili və İdarəedilməsi Mərkəzinin yaradılması təklif olunur. Bu məqsədlə Tədrisin Təşkili və İdarəedilməsi Mərkəzinin Əsasnaməsi hazırlanıb. Mərkəzin Əsasnaməsi “Təhsil haqqında” Qanuna, Təhsil Nazirliyinin hüquqi-normativ sənədlərinə istinad edilməklə hazırlanıb. Bütövlükdə isə bu Əsasnamə 62 sənədə istinad edilməklə işlənib hazırlanıb. Əsasnaməyə görə, Mərkəzin tərkibində 3 şöbənin fəaliyyət göstərməsi nəzərdə tutulur:

1.Tədris şöbəsi
2.Metodiki xidmətlər şöbəsi
3.Tələbə şöbəsi

Əsasnamə ilə hər bir şöbənin vəzifə və səlahiyyətləri müəyyən edilib.

Elmi Şura üzvləri Təhsilin Təşkili və İdarəedilməsi Mərkəzinin Əsasnaməsinin qəbul edilməsinə razılıq veriblər.

Tədris işləri üzrə prorektor, professor M.Cəbrayılov Elmi Şuranın iclasında həm də “2015-2016-cı tədris ilinin yaz-yay imtahan sessiyalarına hazırlığın vəziyyəti barədə” çıxış edib. Prorektor M.Cəbrayılov çıxışı zamanı deyib ki, universitetin rektoru, professor Yusif Məmmədov aprel ayının 6-da “2015-2016-cı tədris ilinin yaz-yay imtahan sessiyasına hazırlıq haqqında” 3/143 nömrəli əmr imzalayıb. Həmin əmrdə yaz semestrinin imtahan sessiyasının Təhsil Nazirliyinin hüquqi-normativ aktlarına uyğun olaraq şəffaf, obyektiv və müvəffəqiyyətlə keçirilməsi məqsədilə fakültə dekanları, kafedra müdirləri, eləcə də digər strukturların rəhbərləri qarşısında konkret vəzifələr qoyulub. Semestr ərzində keçirilmiş 3 kollokviumun nəticələrinin, eləcə də yaz semestrinin imtahan sessiyasına hazırlıq, onun nəticələrinin kafedra iclaslarında və fakültə Elmi Şuralarında müzakirəsinin təşkil edilməsi bu əmrdə öz əksini tapıb. Artıq test sualları Kompüter Mərkəzinə təqdim edilib. Test sualları təkmilləşdirilib, onların keyfiyyəti xeyli yaxşılaşdırılıb. Əyani şöbədə IV tədris ilinin tələbələrinin sonuncu kollokviumlarının 18.04.2015-ci il tarixindən başlayaraq 29.04.2016-cı il tarixinədək, digər tədris ili tələbələrinin 02.05.2016-cı il tarixindən 23.05.2016-cı il tarixinədək, qiyabi şöbədə isə 23.05.2016-cı il tarixindən 01.06.2016-cı il tarixinədək “İKT, Qiymətləndirmə və Monitorinq Mərkəzi” tərəfindən tərtib edilmiş xüsusi cədvəl üzrə keçirilməsi nəzərdə tutulur.

Prorektor M.Cəbrayılov qeyd edib ki, yaz semestrinin imtahan sessiyasının gedişində yarana biləcək münaqişə və şikayətləri həll etmək üçün 11 nəfərdən ibarət “İmtahan qərargahı” öz fəaliyyətini yaz və yay semestrlərinin imtahan sessiyası dövründə də davam etdirəcək. Fakültələr, eləcə də magistratura və doktorantura şöbəsi üzrə imtahanların gedişinə nəzarət edəcək imtahan rəhbərlərinin, nəzarətçi-müəllimlərin, münaqişə komissiyalarının tərkibi müəyyən edilib. İmtahanların gedişinə nəzarət həmin fənn üzrə mütəxəssis olmayan imtahan rəhbərlərinə və nəzarətçi müəllimlərə tapşırılacaq. Əmrdə imtahanların nəticələrinin təlimata müvafiq olaraq tələbələrə çatdırılmasının təmin edilməsi də öz əksini tapıb. İmtahanların keçirildiyi binalarda qayda-qanunlara riayət olunmasını təmin etmək üçün professor-müəllim heyətinin tərkibindən fakültələr üzrə növbətçilər müəyyənləşdirilib. Əmrdə eyni zamanda ADPU-nun filiallarının direktorlarının cari tədris ilinin yaz və yay semestrlərinin imtahan sessiyasını bu əmrin müddəalarına uyğun təşkilini və keçirilməsini təmin etmələri, imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq universitetin Tədris-metodika şöbəsinə və rektorluğa məlumat vermələri müəyyən edilib. Yeni- 2016-2017-ci tədris ilindən ADPU-nun tədris planları filiallarda da tətbiq ediləcək.

“Universitetin dövri elmi jurnallarının nəşri və fakültələrdə elmi seminarların təşkili barədə” Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxış etdi. Asəf müəllim çıxışında “Pedaqoji Universitet Xəbərləri” dövri elmi jurnalının fəaliyyətinin daha da təkmilləşdirilməsi məqsədilə jurnalın müasir tələblərə və beynəlxalq standartlara uyğun çap edilməsini, jurnalın redaksiyasına daxil olan elmi məqalələrə ciddi rəy verilməsini, jurnalın riyaziyyat və təbiət elmləri seriyası, humanitar elmlər seriyası üzrə nəşrinin



vacibliyini, Azərbaycanın və xarici ölkələrin tanınmış alim-mütəxəssislərindən ibarət beynəlxalq redaksiya heyətinin, eləcə də lokal redaksiya heyətinin yaradılmasını təklif etdi. Professor Asəf Zamanov çıxışında həm də fakültə elmi seminarlarının fəaliyyətinin həm keyfiyyət, həm də kəmiyyətcə yüksəldilməsinin ADPU-nun elmi potensialına müsbət təsirini də qeyd etdi. Universitetin saytındakı məlumatların Azərbaycan, rus və ingilis dillərində verilməsini, universitetdə Musiqi pedaqogikası və metodikası dövri elmi jurnalının nəşrinin məqsədəuyğun olduğunu bildirdi. Professor Asəf Zamanov çıxışında Magistratura və doktorantura səviyyəsində xarici dillərin tədrisinin keyfiyyətcə yüksəldilməsinin, yeni informasiya texnologiyaları üzrə bilik və bacarıqların artırılmasının vacibliyi xüsusilə vurğulandı.

Elmi işlər üzrə prorektor, professor Asəf Zamanovun təklifləri Elmi Şura üzvləri tərəfindən qəbul edildi.

“İbtidai təhsil fakültəsinin fəaliyyəti haqqında” hesabatla çıxış edən fakültənin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov fakültənin son illərdəki tədris və elmi fəaliyyəti haqqında danışdı. Qeyd etdi ki, fakültənin əsası 1958-1959-cu tədris ilində qoyulmuşdur. Məqsəd respublikada ali təhsilli ibtidai sinif müəllimi hazırlamaqdan ibarət olmuşdur. Bu günə qədər fakültənin 20 minə yaxın məzunu olmuşdur. Hazırda fakültədə 6 nəfər elmlər doktoru, 41 nəfər fəlsəfə doktoru fəaliyyət göstərir. Son 3 ildə fakültədə 80-dən çox dərslik və dərs vəsaiti, metodik tövsiyə hazırlanmış, 125 fənn proqramı yeniləşdirilmişdir. Əməkdaşlar respublikanın 361, xarici ölkələrin 80 elmi jurnallarında məqalə nəşr etdirmiş, 94 respublika, 51 beynəlxalq elmi konfranslarda iştirak etmişlər. Xaricdə nəşr olunan məqalələrdən 9-u «İmpakt» jurnalındı, 2-si isə «Tomphson Reuters»də çap olunmuşdur. İbtidai təhsil pedaqogikası və metodikası kafedrasının əməkdaşları Yunanıstan, Albaniya, İtaliya, İsveç, Norvec, Danimarka, Finlandiya, Qazaxıstan, Portuqaliya, İs-

(Davamı 3-cü səhifədə)

# Elmi Şuranın iclası keçirilib

(Əvvəli 2-ci səhifədə)

paniya, Türkiyə, Rusiyada keçirilən konfranslarda iştirak etmiş, məqalələri nəşr olunmuşdur. Son 3 ildə fakültədə tələbələrin iştirakı ilə xeyli elmi, bədii kütləvi tədbirlər, şair və yazıçılarla görüşlər təşkil olunmuşdur. Hər il professor-müəllimlərin və tələbələrin ulu öndər Heydər Əliyevin anadan olmasına həsr olunmuş elmi-praktik konfransları keçirilir, məruzələrin materialları nəşr olunur.

Fakültədə tələbə heyəti ildən-ilə artmışdır. 2015-2016-cı tədris ilində 1227 nəfər tələbə təhsil alır ki, onlardan 1021-i əyani şöbədə, 206-sı qiyabi şöbənin tələbələridir. Fakültədə təlim keyfiyyətinin yüksəldilməsi daim diqqət mərkəzindədir. Əvvəlki illərlə tələbə nailiyyətlərini müqayisə edən professor F.Rüstəmov qeyd etdi ki, builki tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələri xeyli uğurlu olmuşdur. Fakültədə təhsil alan tələbələrin 19 nəfəri əlaçı və zərbəçidir.

Son 3 ildə fakültə əməkdaşlarının böyük əksəriyyəti müasir təlim texnologiyaları ilə bağlı treninqlərdə iştirak edərək, 52 sertifikat almışlar. Tələbələr professor Əjdər Ağayevin, professor Vidadi Xəlilovun ustad dərslərinin iştirakçıları olmuşlar. Payız semestrinin imtahan sessiyasının nəticələrinə görə 17 nəfər müəllimin imtahan sessiyasındakı keyfiyyəti 30 %-dən yuxarı olmuşdur.

Professor F.Rüstəmov çıxışın sonunda qeyd etdi ki, bütün bunlar ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun rəhbərliyi ilə universitetimizdə həyata keçirilən məqsədyönlü tədris-təlim, tərbiyə və elmi işlərin nəticəsidir. Fakültə əməkdaşları bundan sonra da onların qarşısında qoyulan vəzifələrin uğurla həyata keçirilməsi üçün səylə çalışacaqlar.

Elmi Şura üzvləri İbtidai təhsil fakültəsinin dekanı, professor F.Rüstəmovun hesabat məruzəsini qəbul edniblər.

"Pedaqoji təcrübənin yoxlanılması üçün yaradılmış Monitorinq Qrupunun hesabatı" ilə çıxış edən dosent Fəxrəddin Yusifov pedaqoji təcrübə ilə bağlı həyata keçirdikləri monitorinqin nəticələri barədə məlumat verib və pedaqoji təcrübənin kefiyyətinin yüksəldilməsi üçün təkliflərlə çıxış edib.

Elmi Şura üzvləri dosent F.Yusifovun hesabatını qəbul ediblər.

"SABAH qrupunun hesabatı" ilə SABAH qrupunun koordinator-rəhbəri Lalə Mürsəlbəyova çıxış edib. L.Mürsəlbəyova qeyd edib ki, SABAH layihəsinin məqsədi ali təhsil sahəsində davamlı, uzunmüddətli, hərtərəfli və əhatəli keyfiyyət dəyişikliklərinin həyata keçirilməsi üçün zəruri mühit yaratmaq, gənclərin fərdi və peşəkar inkişafına dəstək olmaq, dünyanın aparıcı universitetləri ilə əməkdaşlıq layihələri, elmi-tədqiqat, təcrübə və tələbə mübadilələrini genişləndirmək, əmək bazarının tələblərinə uyğun olaraq savadlı, bacarıqlı və hazırlıqlı mütəxəssislər yetişdirməkdir. O, SABAH layihəsinin üstünlükləri haqqında məlumat verərək bildirib ki, bu layihə tələbələrə əlavə təqaüd, bölgələrdə qeydiyyatda olanlar üçün gündə 3 dəfə pulsuz qidalanma daxil olmaqla ödənişsiz yataqxanada yaşamaq, xarici mübadilə proqramları, müasir təşkilat və müəssisələrdə tədris və istehsalat təcrübələri, seçilmiş qabaqcıl müəllim-mütəxəssislər, əmək bazarının daha cazibədar namizədi imkanlarını verir.

L.Mürsəlbəyova qeyd edib ki, ADPU-da "İbtidai sinif müəllimliyi" və "Riyaziyyat-informatika müəllimliyi" ixtisasları üzrə SABAH qrupları fəaliyyət göstərir. Hazırda ADPU-nun SABAH qruplarında 49 nəfər tələbə-gənc təhsil alır. 2014 -2015- ci tədris ilinin payız semestrinin imtahan sessiyası və yaz semestrinin imtahan sessiyası, həmçinin cari tədris ilinin payız imtahan sessiyasının nəticələri barədə məlumat verən L.Mürsəlbəyova bu nəticələrin uğurlu olduğunu bildirib.

SABAH qruplarında təhsil alan tələbələr eyni zamanda Tələbə Elmi Cəmiyyətinə qoşulub, 5 nəfər tələbə məqalə çap etdirib. SABAH qruplarının tələbələri universitetin təşkil etdiyi müxtəlif tədbirlərdə - anım mərasimlərində, aksiyalarda, tamaşa və bayramlarda fəal iştirak ediblər. Bununla yanaşı, SABAH-ın tələbələri ötən il Bakıda keçirilən Birinci Avropa Oyunlarında könüllü olaraq iştirak ediblər. Onların Formula- 1 yarışlarında və "Bir könüllü" hərəkatında da iştirak etmələri nəzərdə tutulur. Qeyd edilənlərdən başqa, SABAH tələbələri dərsdənkənar vaxtlarda Sabah Forumunda, yay təcrübəsində , SABAH Debat Klubunda, "Novruz mühazirələri"ndə, məşhur və maraqlı insanlarla görüşlərdə, açıq dərs və treninqlərdə, Şüvəlan internatındakı uşaqlara dəstək aksiyasında fəal iştik ediblər. Dünyanın aparıcı universitetləri ilə əməkdaşlıq edən SABAH tələbələri müxtəlif layihələr həyata keçiriblər.

Elmi Şura üzvləri SABAH qrupunun koordinator-rəhbəri L.Mürsəlbəyovanın hesabatını qəbul ediblər.

İclasda Müsabiqə Komissiyasının 21 nəfərdən ibarət yeni heyəti də təsdiq edilib.

Elmi Şuranın iclasında cari məsələlər müzakirə olunub, elmi-tədqiqat laboratoriyasına rəhbər, kiçik elmi işçi və kafedralar üzrə dosent vəzifələrinə seçkilər keçirilib.

**Mənsur İBRAHİMLİ**

# Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsində 60 ilin məzunları ilə görüş

Aprel ayının 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsində 60 ilin məzunları ilə görüş keçirilib. Qeyd edək ki, onlar 1956-cı ildə bu fakültənin "Coğrafiya müəllimliyi" ixtisasını bitiriblər. Bu görüş ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun dəstəyi ilə keçirilib. Elə məzunları ilk olaraq ADPU-nun rektoru, professor Yusif Məmmədov qəbul edib. Rektor



Y.Məmmədov məzunlara rəhbərlik etdiyi ali təhsil müəssisəsi ilə həmişə əlaqə saxladıqlarına görə təşəkkür edib və onlara ən xoş, ən səmimi arzularını bildirib. Rektor Y.Məmmədov görüş zamanı Astara rayonundan Əməkdar müəllim Hüseynov Heybət Əli oğluna, Saatlı rayonundan Miriyev Mirqafar Mirtağı oğluna, Qusar rayonundan Məlikov Şakir Səhhət oğluna məzunu olduqları ADPU ilə daim əlaqə saxladıqlarına, bu ali təhsil müəssisəsində keçirilən ictimai-mədəni tədbirlərə və eləcə də universitetin fəaliyyətinə dəstək verdiklərinə görə təşəkkürnamələri, universitetin 90 illiyinə həsr edilmiş kitabı və digər hədiyyələri təqdim edib. Məzunlar da öz növbələrində bu görüşün keçirilməsinə və eləcə də doğma universitetin təşəkkürnamələri ilə təltif edilmələrinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. Görüşdə ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Mətanət Əsgərova iştirak ediblər. Sonra məzunlar universitetin auditoriyalarına, Heydər Əliyev Muzeyinə, "Heydər Əliyev məktəbinin lektoriyası"na, idman zalına baxıblar.

Daha sonra görüş Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsində davam etdirilib. Çay süfrəsi arxasında səmimi və kövrək xatirələr əsasında qurulan söhbət zamanı fakültənin dekanı, dosent Mətanət Əsgərova bir daha məzunları salamlayıb, onlarla fakültədə görüş keçirilməsindən xüsusi məmnunluq duyduğunu bildirib. Dosent M.Əsgərova eyni zamanda görüş zamanı fakültənin 90 illik yubileyi ilə bağlı çap etdirdikləri bukletləri və fakültənin professor-müəllim heyətinin nəşr olunmuş dərsliklərini onlara hədiyyə edib.

Fakültənin tələbə-gəncləri çıxış edərək məzunlarla qürur duyduqlarını bildiriblər və onların layiqli davamçıları olacaqlarını vurğulayıblar.



Görüşdə tanınmış şair, ADPU-nun dosenti, Əməkdar müəllim Oqtay Rza, İqtisadi coğrafiya və coğrafiyanın tədrisi medtodikası kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru Dadaş Ələsgərov, həmin kafedranın baş müəllimi Dünyabəyim Əfəndiyeva, fakültənin məzunu, Ümumi pedaqogika kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru Kəmalə Quliyeva çıxış edərək bildiriblər ki, bu gün görüş keçirdikləri məzunlar 60 ildən çoxdur ki, şərəfli və müqəddəs müəllim peşəsinə sadiq qalaraq respublikamızın müxtəlif rayonlarında şagirdlərə coğrafiya elminin sirlərini öyrədirlər. Biz onlarla ürəkdən qürur duyur, fəxr edirik.

Görüşdə məzunlar- Əməkdar müəllim Heybət Hüseynov, Mirqafar Miriyev, Şakir Məlikov çıxış edərək öz xatirələrini bölüşüblər. Onlar həm də tələbələrə yaxşı oxumağı, elmi biliklərə dərindən yiyələnməyi, öz intellekt səviyyələrini yüksəltməyi, peşəkar müəllim və əsl vətəndaş kimi yetişməyi tövsiyə ediblər.

Məlumat üçün qeyd edək ki, bu görüşdə Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin 60 illik məzunları ilə yanaşı, həm də 30 illik məzunları da iştirak ediblər. Onlardan Bakı şəhərindən fakültənin dekanı, dosent Mətanət Əsgərova, Şəmsiyyə Muradova, Gülxar Rzayeva, Müsabər Xatunova, Təmanət Paşayeva, Ucar rayonundan Sevda Babayeva, Şamaxı rayonundan Nərminə Qədirova, Ağcabədi rayonundan Əzizə Əliyeva, Tovuz rayonundan Zoya İsmayılova bu görüşdə iştirak etmələrindən məmnun qaldıqlarını ifadə ediblər. Onların adından çıxış edən Şəmsiyyə Muradova belə bir görüşün keçirilməsinə görə universitetin rəhbərliyinə və eləcə də fakültənin kollektivinə öz təşəkkürünü bildirib.

Görüş zamanı tələbələr tərəfindən məzunlara, eləcə də çıxış edənlərə gül dəstələri təqdim edilib.

Görüşdə fakültənin tələbələri Şahmar Rüstəmovun, İbrahim Məcidlinin və Məftun Rəsulzadənin ifa etdikləri xalq mahnıları və musiqi nömrələri görüş iştirakçılarında yüksək əhval-ruhiyyə yaradıb, onlara unudulmaz anlar bəxş edib.

Sonda fakültənin dekanı, dosent M.Əsgərova çıxış edərək bugünkü görüşün təşkil edilməsinə görə ADPU-nun rəhbərliyinə öz dərin təşəkkürünü bildirib. Dosent M.Əsgərova həmçinin görüşdə fəal iştirak etdiklərinə görə fakültə Tələbə Gənclər Təşkilatının sədri Elsevər Danyarova, tələbə-gənclərdən Ömər Təhməzliyə, Ülviyyə Vəliyevaya və bu işdə əməyi olan hər kəsə minnətdarlıq edib.

**Mənsur İbrahimli**

# "Günahsız günahkarlar" tamaşasının nümayişi

Məlum olduğu kimi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 iyul 2014-cü il tarixli Sərəncamı ilə "Azərbaycan Respublikasında insan alverinə qarşı mübarizəyə dair 2014-2018-ci illər üçün Milli Fəaliyyət Planı" təsdiq edilib. Milli Fəaliyyət Planında təhsil müəssisələrində insan alveri ilə bağlı maarifləndirmə tədbirlərinin həyata keçirilməsi aidiyyəti dövlət təşkilatları qarşısında mühüm bir vəzifə kimi qoyulub. Bununla əlaqədar olaraq aprel ayının 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında professor-müəllim heyəti və tələbə kollektivi üçün "Sağlam həyat tərzinin təbliği" layihəsi çərçivəsində Gənclər və İdman Nazirliyinin sifarişi ilə Bakı Uşaq Teatrı tərəfindən insan alverinə qarşı mübarizə məqsədilə hazırlanmış "Günahsız günahkarlar" tamaşası nümayiş etdirilib.



ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev tamaşadan öncə çıxış edərək teatrın yaradıcı heyətini salamlayıb. Professor F.Rzayev bildirib ki, bu gün ADPU-da nümayiş etdirilən "Günahsız günahkarlar" tamaşasının mövzusu müasir dövrümüz üçün çox aktualdır. Belə ki, tamaşa çağdaş dövrümüzün qlobal problemlərindən biri olan insan alverinin tanıdılmasına həsr olunub. Tamaşa tələbə-gənclərin bu ümumbəşəri bəlaya qarşı maarifləndirməsi baxımından mühüm əhəmiyyət kəsb edir.



Gənclər və İdman Nazirliyinin baş məsləhətçisi Fərid Qurbanzadə çıxış edərək ADPU-nun rəhbərliyinə tamaşanın nümayiş etdirilməsi üçün göstərdiyi köməyə görə təşəkkür edib. F.Qurbanzadə qeyd edib ki, hazırda dünyanın bütün ölkələri insan alveri, silah alveri, narkomaniya, məcburi əməyə cəlb edilmə, surroqat ana və digər ağır cinayətlərlə qarşılaşıblar. Bu baxımdan, "Günahsız günahkarlar" tamaşasının mövzusu hamının diqqətini cəlb edir və bu günümüzlə çox səsləşir.

Bakı Uşaq Teatrının bədii rəhbəri və direktoru İntiqam Soltan çıxış edərək "Günahsız günahkarlar" tamaşasının ərsəyə gəlməsinə göstərdiyi köməyə görə Gənclər və İdman Nazirliyinin rəhbərliyinə və eləcə də tamaşanın ADPU-da nümayişinə verdiyi dəstəyə görə universitetin rəhbərliyinə öz minnətdarlığını bildirib.

Qeyd edək ki, "Günahsız günahkarlar" tamaşasının rejissoru Bakı Uşaq Teatrının bədii rəhbəri və direktoru İntiqam Soltan, ssenari müəllifi isə Arzu Soltandır. Tamaşanın rəssamı Sevda Məmmədova, bəstəkarı Mahir İbrahim, rəqslərin quruluşçusu isə Könül Şahbazovadır.Tamaşada rolları İlhamə Əhmədova, Könül Şahbazova, Niyaz Qasımov, Cavanşir Məhərrəmov, Türkan Şahmarlı və digər aktyorlar ifa edirlər.



Tamaşada insan alveri, həmçinin insan orqanların transplatasiyası, cinsi istismara məruz qoyma və məcburi əməyə cəlb edilmə kimi ağır bəşəri cinayətlərin faciəli nəticələri təsirli şəkildə tamaşaçıya çatdırılır. Eyni zamanda insanların sadəlövlüyündən, təcrübəsizliyindən və məlumatsızlığından sui-istifadə edərək onları bu faciəli yola sürükləyən mənəviyyatsız şəxslər kəskin tənqid edilirlər. Tamaşa həm də belə mənfi hallardan düzgün nəticə çıxarmaq baxımından mühüm əhəmiyyət kəsb edir və böyük ibrətamiz əhəmiyyətə malikdir. Məlumat üçün onu da qeyd edək ki, bu tamaşa artıq respublikamızın bir çox bölgələrində və ali təhsil müəssisələrində nümayiş etdirilib və marağa səbəb olub.

Aktual mövzü və özünəməxsus rejissor həllinə malik olan "Günahsız günahkarlar" tamaşası ADPU-nun professor-müəllim heyəti və tələbə kollektivi tərəfindən də maraqla qarşılanıb.

# Nitq mədəniyyəti barədə - IV yazı



Səsi ilə insanların qəlbini ovlayan, Azərbaycan dilini sevdirən diktorlar olub və olacaqdır. Məsələn, Aydın Qaradağlı səsinin aydınlığı və məftunedici diksiyası ilə dinləyicilərin qəlbini ovlamışdır. Aydın Qaradağlının oğlu Vüqar Qaradağlı atası ilə bağlı verdiyi müsahibələrin birində deyirdi: “O, sənətinin vurğunu, peşəkarı olub. Fəaliyyətə başladığı ildən *(1946-cı ildə radioda fəaliyyətə başlayıb - B.X.)* ömrünün sonuna kimi o, radioda həmişə bir səslə - aydın danışıb. Onun danışdığı səs isə radio üçün lazımlı bir səs idi. Bu səs tempini atam özü tapmışdı, yəni səsinin tonunu özü müəyyənləşdirmişdi. Düşünürəm ki, on yeddi yaşında bir gəncin özünü təqdim etməyi bacarması yalnız və yalnız onun daxili zənginliyindən xəbər verə bilər”. *(bax: Xatirələrdə yaşayan yaxşılar - Aydın Qaradağlı kimi. - “Kaspi” qəzeti, 29 yanvar 2015, 017 (3328), s.8)* İndi sənətinin vurğunu olanlara, aydın danışanlara (söhbət diktorlardan gedir) ehtiyac var. Bəzi diktorlar və aparıcılar aydın danışığa, səsə yox, daha çox ölçü-biçidən kənara çıxan artıq-əksik hərəkətlərə yol verirlər. Artıq-əksik əl hərəkətləri, heç bir ölçüyə gəlməyən duruşları, baxışları ilə tamaşaçını yoranlar çoxalıb. Onlar nitq mədəniyyətindən tamamilə uzaqdırlar. Nitqi aydın, səlis, məntiqli qurmaq bacarığından məhrumdurlar. Sadəcə olaraq yorucu səs tonu ilə boğazdanyuxarı, pafosla danışmaqla tamaşaçı ilə süni yolla ünsiyyət qurmaq istəyirlər. Tələbkar tamaşaçı ilə onlar bu ünsiyyəti qura bilmirlər, zahiri parıltıya aludə olanları müvəqqəti olaraq ələ alırlar. Yenə də Vüqar Qaradağlının atası Aydın Qaradağlı ilə bağlı verdiyi msahibədən bir məqamı xatırlamalı oluruq: “O, pafosu sevməzdi, həyatda olduğu kimi işinə də səmimi yanaşırdı. Radioda dinləyicinin istəyini hiss edib onlara xitabən veriliş aparmaq çətin məsələ idi. Üzünü görmədən dinləyicilərin istəyini yerinə yetirmək özü ustalıq tələb edirdi. Aydın müəllim bunu çox gözəl bacarırdı. Səsi ilə, aydın və məftunedici diksiyası ilə. Bu da ondan irəli gəlirdi ki, o, sənətinin peşəkarı idi”. *(bax: Xatirələrdə yaşayan yaxşılar - Aydın Qaradağlı kimi. - “Kaspi” qəzeti, 29 yanvar 2015, 017 (3328), s.8)*

Radio elə bir sahədir ki, o, televiziyadan fərqli olaraq daha çox səsə, aydın diksiyaya ehtiyac hiss edir. Burada diktorun, aparıcının digər jestləri görünmür. Yalnız onun səsi və diksiyası eşidilir. Burada dinləyicinin pafosa yox, səmimiyyətə ehtiyacı var. Onu da gərək dinləyiciyə məqamında, yerində çatdıra biləsən. Ancaq nədəndirsə, indi diktorların, aparıcıların bir qismi dinləyici və tamaşaçılar arasında səmimiyyət yaratmağı öz səslərində, diksiyalarında, məntiqli, aydın nitqlərində yox, pafoslu (ancaq bu pafosda əksər vaxt aydın fikir, məntiq olmur) sözlərində, dinləyicidə, tamaşaçıda ikrah yaradan əttökən jestlərində *(yerli-yersiz söz işlətməkdə, mental və milli xüsusiyyətləri nəzərə almamaqda və s.-də)* axtarırlar.

Nitq mədəniyyətinin formalaşmasında kitabın rolu, daha doğrusu, bədii ədəbiyyat mütaliəsi aparıcı rol oynayır. Dünyada gedən dəyişikliklər, təbii ki, kitab oxumaq mədəniyyətinə də mənfi təsirini göstərir. Keçmiş Sovetlər İttifaqında uşaqların və böyüklərin oxuyacaqları kitabların çeşidləri hər bir kəsə aydın idi. Nəyi oxumaq lazımdır, nə üçün oxumaq lazımdır suallarına hər bir kəs cavab tapa bilirdi. Bu da nəticə etibarilə uşaqlıqdan başlayaraq hər bir kəsin lüğət ehtiyatının formalaşmasına müsbət təsir göstərirdi. Bədii əsər oxumaq uşağı da, böyüyü də qürrələndirirdi və onların hər birinin iftixar yerinə çevrilirdi. İndi isə nəyi oxumaq, niyə oxumaq, sualına cavab axtaranlar azalıbdır. Həm də oxunanların oxucuya nə verəcəyini düşünənlər yenə də azalıbdır. Uşaqlar da, böyüklərin əksəriyyəti də bədii kitab oxumaqdan daha çox romantika və macəra axtarırlar. Halbuki keçmişdə bədii əsərlərin oxunması yolu ilə bu romantika və macəralara olan boşluq aradan qaldırılırdı, oxucunun təfəkkürü, təxəyyülü inkişaf edirdi. Oxucu təkcə oxuduğu əsərin məzmunu ilə kifayətlənmir, həm də oxuduğu əsərin dil mühiti ilə əlaqəyə girir, ünsiyyət qururdu. Oxunan hər bir bədii əsər oxucunu zəngin və möcüzəli dil mühitində yetişdirirdi. Hər bir bədii əsərin dili məhz dildən qurulan çələngdir. Beləliklə, oxucu nə qədər bədii əsər oxuyurdusa, bir o qədər çələnglər mühitində olurdu. Təəssüflər olsun ki, belə bir mühitə bu gün ehtiyac hiss etməyən oxucular az deyildir.

Dili öyrənməyin, məhz doğma ana dilini öyrənməyin yollarından biri də bədii əsərləri oxumaqdır. Ancaq indi bədii əsərləri oxumaq işinə həvəs azalıbdır. Bədii əsərlərin oxunmasına oxucu tərəfindən həvəsin azalması bir sıra səbəblərlə bağlıdır. Əgər bir tərəfdən yazarların oxucu auditoriyasını ələ almağı bacarmaması ilə bağlıdırsa, digər tərəfdən oxucu zövqünün korşalması ilə bağlıdır. Əgər yazar yaxşı yaza bilmirsə, deməli, o, həyatla ayaqlaşa bilmir, onun bədii təfəkkürü və təxəyyülü həyatdan geridə qalır. İndi real həyat hadisələrini əks etdirən bədii əsərlər çox azdır. Müqayisə üçün qeyd edək ki, Sovet dövründəki bədii əsərlər həyat hadisələrini daha dolğun əks etdirirdi. O dövrdə həyatın özündən gələn saysız-hesabsız mövzularda bədii əsərlər yaranırdı. Həyatdan götürülmüş, həyatın özündən doğulmuş mövzular həm də yazıçı üçün real həyat hadisəsidir. Yazıçının real həyat hadisələrini bir mənbəyə çevirməsi dedikdə təkcə onu nəzərdə tutmuruq ki, yazıçı yalnız oxucunu düşünsün. Yazıçının yalnız oxucunu düşünməsi ədəbiyyatın inkişafını geridə də qoya bilər. Ona görə ki, hələ oxucunun hansı mövzudan xoşu gəldiyi, hansı mövzudan xoşu gəlmədiyi barədə olan mövqeyi etalon deyildir. Yazıçı bəzən zövqü olmayan oxucu istəyinin arxasına düşüb getməklə ədəbiyyatın səviyyəsini aşağı sala bilər. Yazıçının özünün intellektual səviyyəsi, zövqü, dünyagörüşü olmalıdır. Yazıçı bəzən dəbə çevrilmiş üslub və forma arxasına düşüb getməməlidir. Məsələn, bəziləri detektiv yazmağa can atırlar ki, müasir oxucunu ələ ala bilsinlər. Yaxud bəziləri sərbəst vəzndə şeirlər yazırlar ki, özlərini müasir təqdim etsinlər. Bəziləri isə modernist və posmodernist olmaq iddiasına düşürlər ki, bu da “oxucu auditoriyası” toplamaqdan başqa bir şey deyildir. Əslində bu, hay-küy qaldırmaqdan, oxucuya süni şəkildə yol tapmaqdan başqa nədir? Bədii keyfiyyət olan yerdə ədəbiyyatda modernistlik, postmodernistlik axtarmaq əbəsdir. Bunun arxasına düşüb qaçmaq ədəbiyyata heç nə vermir. Bədii ədəbiyyat müəyyən fəlsəfi ideyaların daşıyıcısı kimi həm ədəbiyyata, həm də bu ədəbiyyatı oxuyan oxucunun intellektual səviyyəsinə xidmət edir. Əsl ədəbiyyat belə yaranıb və belə yaranır. Əsl ədəbiyyat dəbdə olan üslubların arxasına düşüb getməklə yaranmır. Əsl ədəbiyyat öz üslubuna sadiq olanların yüksək zövqlə, intellektual səviyyə ilə yaratdıqları ədəbiyyatdır. Əgər yazıçının zövqü, intellektual səviyyəsi yoxdursa, o, nə qədər maraqlı olan mövzuya müraciət etsə də, yaxşı əsər yaza bilməyəcəkdir. İntellektual səviyyəyə müraciət olunan mövzu ilə bağlı dərin bilgi, məlumat, müşahidə və bir də ki bunları qaydaya salan yüksək bədii təfəkkür, bədii təxəyyül daxildir. Bunlar olmasa, yazıçı ən maraqlı mövzunu bədii cəhətdən, sənətkarlıq baxımından korlaya bilər. Eyni mövzuda yazanlar, eyni mövzuya müraciət edənlər arasında bir neçəsi ona görə seçilir ki, onlarda intellektuallıq başqalarından öz yüksək səviyyəsi ilə fərqlənir. Məsələn, Azərbaycan ədəbiyyatında sanballı dramlar olub və olacaqdır. Ancaq bu istiqamətdə Mirzə Fətəli Axundzadənin, Nəcəf bəy Vəzirovun yaradıcılığı öz intellektuallığı ilə fərqlənib və fərqlənəcəkdir. Azərbaycan ədəbiyyatının təcrübəsindən çıxış edərək onu da qeyd edək ki, yazıçı istedadını, qabiliyyətini, sənətkarlığını, intellektual səviyyəsini hər bir oxucunun anlaya biləcəyi bir üslubda təqdim etməyi bacarmalıdır. Belə ki, oxucu auditoriyasının tərkibi və səviyyəsi müxtəlifdir. Onların hər birini anlatmaq artıq yazıçının qabiliyyətidir. Cəlil Məmmədquluzadəni, Səməd Vurğunu, Bəxtiyar Vahabzadəni hamı sevir. Ona görə ki, onlar müxtəlif zövqlü oxucuların hər birini anlada bilir, hər birinin zövqünü oxşaya bilirlər. Burada onların intellektual səviyyəsi mühüm rol oynayır. Oxucunun sevimlisi olan hər bir şair və yazıçı müraciət etdiyi mövzunu intellektuallığının səviyyəsi ilə yaxşı mənada bəzəyir, cəlbedici bir formaya salır. Yəni təkcə mövzu ilə, təkcə intellektuallıqla heç nəyi əldə etmək olmaz. Bunların hər ikisinin vəhdəti ədəbiyyatın inkişafı deməkdir. Biz məhəbbət mövzusu deyəndə Məhəmməd Füzulini yada salırıq. Ona görə ki, onun yaradıcılığında məhəbbət mövzusu ilə intellektual səviyyə vəhdətdədir. Təbiət mövzusu deyəndə Hüseyn Arifi, Zəlimxan Yaqubu, Musa Yaqubu və digərlərini yada salırıq. Burada da vəziyyət eynidir. Detektiv mövzu deyəndə Çingiz Abdullayevi, Elxan Elatlını, Varis Yolçuyevi yada salırıq və s.

**Buludxan Xəlilov,**
**Filologiya fakültəsinin dekanı,**
**filologiya üzrə elmlər doktoru, professor**

# Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsində 2 Aprel-Autizm Ümumdünya Maarifləndirmə Gününə həsr olunmuş tədbir



1 aprel 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsinin rəhbərliyi və Korreksiyaedici təlim şöbəsinin tələbə və magistrantlarının təşəbbüsü ilə 2 Aprel-Autizm Ümumdünya Maarifləndirmə Gününə həsr olunmuş tədbir keçirildi. Tədbirə “Autizm idman və yaşam” klubunun autist uşaqları, müəllimləri və valideynləri dəvət olunmuşdular. Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva qonaqları salamlayaraq tədbirin həm tələbələr, həm də autist uşaqlar üçün önəmli olduğunu qeyd etdi.

Korreksiyaedici təlim kafedrasının müdiri Nailə Hüseynova öz çıxışında qeyd etdi ki, tələbələrin autist uşaqlarla ünsiyyətdə olmaları onların bu sahədə fəaliyyət göstərmələrinin ilkin təcrübə addımlarıdır. Tədbirin sonunda tələbələr uşaqlara hədiyyələr təqdim etdilər. “Autizm idman və yaşam” klubunun rəhbəri Elnur Məmmədov və valideynlər çıxış edərək fakültə rəhbərinə və tələbələrə minnətdarlığını bildirdi.

**Emin AYDAYEV,**
**II kurs tələbəsi**

# Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsində görüş



4 aprel 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, Psixoloji xidmət və Korreksiyaedici təlim fakültəsinin korreksiyaedici təlim şöbəsinin IV kurs tələbələrinin Təhsil Nazirliyinin (TN) Deinstitutlaşma və Uşaqların Müdafiəsi İdarəsinin Xüsusi təhsil şöbəsinin müdiri Anar Xalafovla görüşü keçirildi. Bu görüşün keçirilməsində əsas məqsəd tələbə-gənclərin xüsusi təhsil sistemində baş verən islahatlar haqqında maarifləndirilməsi idi. Görüş zamanı tələbələrlə inklüziv təhsil mövzusu ətrafında maraqlı diskussiyalar aparıldı, slaydlar göstərildi. Qeyd edək ki, TN-nin Deinstitutlaşma və Uşaqların Müdafiəsi İdarəsinin Xüsusi təhsil şöbəsinin müdiri Anar Xalafov tələbələrin fikirlərini diqqətlə dinləyib onlarla fikir mübadiləsi apardı.

Görüşün sonunda A.Xalafov belə görüşlərin müntəzəm keçirilməsinin və tələbələrlə birgə əməkdaşlığın davamlı olmasının vacibliyini qeyd etdi.

**Səbinə ASLANOVA,**
**Korreksiyaedici təlim kafedrasının**
**baş müəllimi**

# ADPU-nun Quba filialında Azərbaycanın ərazi bütövlüyü uğrunda mübarizə aparan əsgərlərimizə dəstək aksiyası keçirildi



5 aprel 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialında Azərbaycanın ərazi bütövlüyü uğrunda mübarizə aparan əsgərlərimizə dəstək məqsədilə izdihamlı tədbir keçirilmişdir. Tədbir Vətən uğrunda qəhrəmancasına canlarından keçmiş şəhidlərimizin ruhunun bir dəqiqəlik sükutla yad edilməsi ilə başlanmışdır.

ADPU-nun Quba filialının direktoru, professor Əli Allahverdiyev tədbiri giriş sözü ilə açaraq son günlər cəbhə xəttində baş verən hadisələrdən, Azərbaycan Ordusunun ermənilər üzərində qələbəsindən, Azərbaycan xalqının Vətənimizin ərazi bütövlüyü uğrunda göstərdiyi şücaətdən, həmrəylikdən, şəhid olmuş soydaşlarımızın xalqımız üçün örnək olacaq qəhrəmanlıqlarından ətraflı danışmışdır.

ADPU-nun Quba filialının Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeava, Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Güləddin Həmzəyev, Pedaqoji və ictimai fənlər kafedrasının müəllimi Novruz Kərimov, Tələbə Gənclər Təşkilatının sədri İlkin Xanlarzadə, “Azərbaycan dili və ədəbiyyatı müəllimliyi” ixtisasının tələbələri Rahil Məmmədov, Zöhrə Rzayeva, “Təhsildə sosial-psixoloji xidmət” ixtisasının tələbəsi Mətanət Mustafazadə tədbirdə çıxış edərək Azərbaycan Ordusu ilə fəxr etdiklərini və yaşlarından asılı olmayaraq, Vətən üçün canlarından keçməyə hazır olduqlarını bildirdilər.




Tədbirdə “Rədd olsun ermənilər!”, “Ya Qarabağ, ya ölüm!”, “Can Azərbaycan!” və bu kimi şüarlar səsləndirən tələbə-gənclərin mübarizə əzmi qəlblərdə bir qürur hissi oyatdı.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin ifası ilə başa çatdı.

# Şair Qəşəm Nəcəfzadə ilə görüş

Aprel ayının 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik akt zalında Filologiya fakültəsi tələbələrinin təşəbbüsü ilə Azərbaycan Yazıçılar Birliyinin İdarə Heyətinin üzvü, uşaq ədəbiyyatı şöbəsinin rəhbəri, “Azərbaycan” jurnalının poeziya şöbəsinin müdiri, istedadlı və tanınmış şair-publisist Qə-



şəm Nəcəfzadə ilə görüş keçirilib. Görüşü Filologiya fakültəsinin dekanı, filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilov açaraq bugünkü görüşün daxili mənəvi tələbatdan irəli gələn səmimi və fərqli bir görüş olduğunu bildirib.

Professor B.Xəlilov qeyd edib ki, insan həyatda daim özünü axtarır, özünü tanımağa, kəşf etməyə çalışır. Şair və yazıçılarla keçirilən belə görüşlər insana özünü tapmasına, özünü həyatda təsdiq etməsinə kömək edir. Tələbə-gənclərlə keçirilən belə görüşlər isə onların dünyagörüşlərinin genişlənməsinə, daxili mənəvi dünyalarının zənginləşməsinə müsbət təsir göstərir.

Professor B.Xəlilov çıxışına davam edərək şair Qəşəm Nəcəfzadənin həyat və bədii yaradıcılığı haqqında məlumat verib. Professor B.Xəlilov bildirib ki, Q.Nəcəfzadə 1959-cu il aprel ayın 1-də İmişli rayonunun Əliqulular kəndində anadan olub. 1981-ci ildə Gəncə Dövlət Universitetinin Filologiya fakültəsini bitirib.1986-cı ildən Azərbaycan Yazıçılar Birliyinin üzvüdür. Uzun müddət İmişlidə və Bakı şəhərində Azərbaycan dili və ədəbiyyatı müəllimi işləyib. Bir müddət “Mədəniyyət” qəzetində məsul katib vəzifəsində çalışıb. Q.Nəcəfzadə 25 kitabın müəllifidir. Bu kitablardan 10-u xarici ölkələrdə çap olunub. Şeirləri 20-dən çox xarici dilə- rus, ingilis, fransız, alman, özbək, qırğız, alban, ispan, fars, polyak, gürcü, tamil və başqa dillərə tərcümə olunub. Onun ‘Sevginin sonunu deməyin mənə’, ‘Yatmış dəniz şəkli’, ‘Bir gəlin dalğa ilə yan-yana’, ‘Gülümsəyən ağac’, ‘Şeirimin bəxti’, ‘Sevmək istəyirəm təzədən’, “Sarı sim”, ‘Sən yadıma düşəndə’,



‘Özümə doğru’, “Ömür kitabıma düzəliş”, “Və sairə”, “Hüseynbala Mirələmovun ədəbi həqiqətləri”, “Qadının ölümü”, “Savaş, ayaqqabı, ölüm”, “Ölülər bəzə gülür”, “Oğlum, qapını aç, qapıda bir külək ölür”, “Barmaqların öpüşü”, “Şeirin içindəki adam”, “Adı Qəşəm”, “Bir dəli şeytan deyir”, rus dilində “Veçerinie liyudi” (“Axşam adamları”) və müxtəlif xarici dillərə tərcümə olunmuş digər əsərləri Azərbaycan oxucusuna yaxşı tanışdır. Qəşəm Nəcəfzadə özünəməxsuz yaradıcılıq üslubuna, dəst-xəttinə malik bir şairdir.



Əsərləri ardıcıl çap olunur. Mətbuatda da mütəmadi olaraq müxtəlif aktual mövzularda çıxışlar edir. Q.Nəcəfzadə müasir Azərbaycan ədəbiyyatının tanınmış nümayəndələrindən biridir.

Q.Nəcəfzadə 2007-ci ildə Hollandiyada keçirilən 38-ci Beynəlxalq Poeziya Festivalında iştirak edib. O, 2006-ci ildə Tofiq Mahmud, 2008-ci ildə Beynəlxalq Rəsul Rza mükafatına layiq görülüb.

Şair-publisist Q.Nəcəfzadə çıxış edərək bu görüşün keçirilməsinə görə ADPU-nun rəhbərliyinə öz dərin təşəkkürünü bildirib. O, eyni zamanda görüşün təşkili üçün Filologiya fakültəsinin rəhbərliyinə və tələbə-gənclərinə minnətdarlığını ifadə edib.

Görüşdə tələbələr Qəşəm Nəcəfzadənin şeirlərini söyləyiblər.

Q.Nəcəfzadə görüşün sonunda öz şeirlərini oxuyub, tələbələrin müasir ədəbi proses, ədəbi tənqid, uşaq ədəbiyyatı, modernizim və postmodernizimlə bağlı suallarını cavablandırıb.

Görüşdə tanınmış şairlər Balayar Sadiq, Nuranə Nur və digərləri çıxış edərək Q.Nəcəfzadəni yüksək bədii istedada malik şair, dəyərli ziyalı və əsl vətəndaş kimi səciyyələndirərək ona yeni yaradıcılıq uğurları arzulayıblar.

**“Gənc müəllim”**

# Ədəbi-nəzəri fikrin tədqiqi

***”Mən bütün ömrümü, həyatımı şeirə, sənətə, ədəbiyyata, onun tədqiqinə və təbliğinə həsr etmişəm. Hərdən mənə elə gəlir ki, ədəbiyyat mənim Leylimdi, mən isə onun Məcnunu”.***

**(Rafiq Yusifoğlu)**

Tanınmış şair, ədəbiyyatşünas, Azərbaycan Respublikasının Əməkdar mədəniyyət işçisi, filologiya üzrə elmlər doktoru, professor Rafiq Yusifoğlunu (Əliyev Rafiq) tələbəlik illərindən - 60-cı illərin sonlarından tanıyıram, indi də bir kafedrada işləyirik; belə demək mümkünsə, cavanlığımız və ahıllığımız bir yerdə keçir. Onun insanlığı, təvazökarlığı, həqiqətin, haqqın yanında olması, səmimiyyəti və obyektivliyi bir qələm və ürək dostu kimi həmişə məni qane edibdir. Hələ gənclik illərindən istedadlı bir qələm sahibi kimi tanımışam, uzun illər mətbuatda imzasını maraqla izləmişəm, haqqında yazmışam, fikir və münasibətimi bildirmişəm, istər şeirlərini, istərsə də elmi-publisistik məqalələrini, kitablarını məmnunluq hissi ilə oxumuşam.

Bədii yaradıcılıq mühitində tanınan kəslərdən biridir. Şair kimi, xüsusən, uşaq dünyasına hakim olan şair kimi məşhurdur. Bir sözlə, müasir dövrümüzün maraqlı həyat və yaradıcılıq yolu keçən tanınan ziyalı şəxsiyyətlərindən biridir

Rafiq Yusifoğlu 1950-ci il yanvar ayının 2-də Qubadlı rayonunun Çardaxlı kəndində müəllim ailəsində doğulmuşdur. Burada səkkizillik məktəbi, Qubadlı qəsəbə orta məktəbində onillik məktəbi bitirmişdir (1966). O, Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU-nun) Filologiya fakültəsində ali təhsil almışdır. (1966-1970). Bir müddət Sumqayıt şəhərində müəllim işləyən Rafiq Yusifoğlu AMEA-nın Nizami Gəncəvi adgna Ədəbiyyat İnstitutunun aspiranturasına daxil olmuşdur. ”Azərbaycan Sovet poemasının inkişaf problemləri” mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir(1984). Ümumiyyətlə, Azərbaycan poema janrının problemləri onun tədqiqatının stixiyasını təşkil edir. Təsadüfi deyildir ki, R.Yusifoğlu 2007-ci ildə ”XX əsr Azərbaycan poemasının sənətkarlıq xüsusiyyətləri” mövzusunda dissertasiya müdafiə edərək filologiya elmləri doktoru adını almışdır.

Ümumiyyətlə, onun ədəbi-ictimai fəaliyəti olduqca maraqlı və səmərəli olmuşdur və bu sayaq da, davam etməkdədir. 1985-ci ildən 1992-ci ilədək ”Göyərçin” jurnalgnda söbə müdiri, 1992-ci ildən 1996-cı ilədək məsul katib, 1996-1997-ci illərdə Azərbaycan Dövlət Televiziyasının ”Xəbərlər” baş redaksiyasında ”Elm, mədəniyyət, incəsənət” şöbəsinin müdiri vəzifəsində çalışmışdır.1997-ci ildən ”Göyərçin” jurnalının baş redaktorudur. Şairin uşaq ədəbiyyatı sahəsində xüsusi fəaliyyəti vardır.

Hazırda Sumqayıt Dövlət Universitetinin (SDU) Azərbaycan ədəbiyyatı kafedrasının və ADPU-nun professorudur. Azərbaycan Respublikasının Əməkdar mədəniyyət işçisidir (2005).

O, gənc tənqidçilərin Moskvada keçirilən birinci (1982, ikinci (1985) və üçüncü (1988) Ümumittifaq seminarlarının, Qazaxıstanda keçirilən Beynəlxalq Uşaq Ədəbiyyatı günlərinin (1989) iştirakçısı, 1985-ci ildə Moskvada Ali Komsomol Məktəbinin bir aylıq jurnalistika kursunun müdavimi olmuşdur.

R.Yusifoğlu ədəbi fəaliyyətə hələ orta məktəbdə oxuyarkən başlamış, 1966-cı ildən şeirləri, məqalələri ilə mətbuatda çıxış etməyə başlamışdır. Son illər bədii tərcümə ilə ciddi məşğul olur. F.Q.Lorkanın, Corc Bayronun, Peter Şyuttun, Hans Yurgen Hayzenin, Ulla Hanın, Roza Auslenderin və başqalarının şeirlərini, dünya uşaq ədəbiyyatının gözəl nümunələrini dilimizə tərcümə etmişdir. Əsərləri bir sıra dillərə tərcümə edilib, dərsliklərə düşüb. Çoxlu mahnı mətnlərinin, elmi-publisistik məqalələrin müəllifidir. Əsərləri əsasında ”Qəm karvanı”, ”Bütün Azərbaycan əsgər olmalı” televiziya tamaşaları çəkilib, dəfələrlə nümayiş etdirilmişdir. Bütün ömrünü, həyatını ədəbiyyata, onun tədqiqi və təbliğinə həsr edən R.Yusifoğlu çoxşaxəli yaradıcılıq yolu keçən istedadlı qələm sahiblərindəndir. Onun istər poeziya, istər uşaq ədəbiyyatı, istər bədii tərcümə, istər jurnalistika, istərsə də ədəbiyyatşünaslıq sahəsindəki uğurları göz qabağındadır.

Professor R.Yusifoğlunun əllidən çox şeir kitabı, elmi monoqrafiyası, dərslikləri vardır. İyirmi ilə yaxındır ki. respublikanın ali məktəblərində mühazirələr oxuyur və biz bu gün qarşımızda olan onun son ədəbiyyatşünaslıq-tədqiqat işi - ”Ədəbi-nəzəri fikrin inkişaf mərhələləri” (Bakı, ”Elm və təhsil”, 2016, - 368 s.) kitabını əlimizdə əsas tutaraq R.Yusifoğlunun həm bu tədqiqatından, həm də ümumiyyətlə, ədəbi-nəzəri fikir dünyasından danışmaq, oxucularımıza onun elmi fəaliyyəti barəsində məlumat vermək istərdik.

Bəri başdan deyim ki, son vaxtlar belə sanballı, yüksək nəzəri səviyyəli kitab oxumamışdım. Əsəri böyük zövqlə, azalmayan bir maraqla mütailə etdim. Əsər mənim içimdə məmnunluq hissi oyatdı. Tədqiqatın monumentallığı və əhatəliliyi onu da göstərir ki, Rafiq müəllim bu işi qısa müddətdə deyil, uzun illər boyu ciddi araşdırmalar və axtarışlar sayəsində hasilə gəlmişdir. Tədqiqat boyu elmi-nəzəri materialın əhatəliliyi, konkret nəzəri problemlər üzrə qruplaşdırılıb araşdırılması məqbul və xoşagələndir. Obyektiv və ayıq elmi münasibət, irəli sürülən mülahizələr, tezislər inandırır, dolğunluğu və aktuallığı ilə diqqəti çəkir.

Göründüyü kimi, R.Yusifoğlunun bu monoqrafiyası da aktual problemə həs edilibdir. Müəllif araşdırmalarını düzgün metodoloji əsasda qurduğundan, ədəbi-nəzəri fikrin inkişaf mərhələlərini düzgün müəyyənləşdirdiyindən və hər mərhələni dürüst qiymətləndirərək ətraflı izlədiyindən mövzu və problematika haqqında dolğun təsəvvür yarada bilmişdir. Beləliklə, biz o qənaətdəyik ki, doktor-professor R.Yusifoğlunun ”Ədəbi-nəzəri fikrin inkişaf mərhələləri” tədqiqat əsəri bu istiqamətdə boşluğu doldurmağa, ehtiyacı ödəməyə xidmət edir.

Yeri gəlmişkən, qeyd edim ki, professor R.Yusifoğlunun bu istiqamətdə bir sıra dəyərli tədiqat işləri də məlumdur. Onun ”Azərbaycan poeması: axtarışlar və perspektivlər.” Bakı: “Elm”, 1998; ”Ədəbiyyatşünaslığın əsasları.” Bakı: “Sabah”, 2001; ”Uşaq ədəbiyyatı.” Bakı: “Təhsil”, 2002; ”Müasir ədəbi proses və ədəbi tənqid.” (dərslik), Bakı: “Çaşıoğlu”, 2004; ”Ədəbiyyatşünaslığın əsasları.”, Bakı: “Şivannəşr”, 2005; ”Uşaq ədəbiyyatı.” Bakı: “Şivannəşr”, 2006; ”Ana dili (Əlifba, oxu).”, Ümumtəhsil məktəblərinin birinci sinifləri üçün dərslik. Bakı: “Çaşıoğlu”, 2008; ”Azərbaycan poemasının sənətkarlıq xüsusiyyətləri”, Bakı: ADPU-nun nəşriyyatı, 2010 və dediyimiz ”Ədəbi-nəzəri fikrin inkişaf mərhələləri” monoqrafik tədqiqatları, dərslikləri, kitabları uzun illərdir ki, ali məktəblərin filologiya fakültələrində dəyərli tədris vasitəsi kimi istifadə olunmaqla yanaşı, müasir ədəbi elmi-nəzəri fikrimizin dəyərli nümunələri kimi də, qəbul edilir, fundamental ədəbiyyatşünaslığımızın nailiyyəti təkin qiymətləndirilir.

Bu qədər faydalı əsərləri araya-ərsəyə gətirmək Rafiq müəllimin istedadından, tükənməz yaradıcılıq enerjisindən, zəhmətsevərliyindən xəbər verən danılmaz faktlardır. O, bu zəhməti və istedadı müqabilində “Qızıl qələm”, “İlin ən yaxşı kitabı”, “Araz”, “Vətən” və s. ali ədəbi mükafatlarının laureatı kimi də mükafatlandırılmışdır.

R.Yusifoğlu rəsmən elm aləminə 1979-cu ildə daxil olub və dediyim kimi, bu işə AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun aspiranturasından başlayıb, görkəmli ədəbiyyatşünaslarla ünsiyyətdə olub. Ustadlarını, xeyirxahlarını unutmayan, qədirbilənliklə onları yad edən Rafiq yazır: ”İndi dünyalarını dəyişmiş çox hörmətli ədəbiyyatşünaslarla - Mirzağa Quluzadə, Məmməd Cəfər, Əziz Mirəhmədov, Kamal Talıbzadə, Yəhya Seyidov, Qasım Qasımzadə, Əkbər Ağayev, Yaşar Qarayev, Mirəli Seyidov, Atif Zeynallı, Şamil Salmanov, Arif Hacıyev, Kamran Məmmədov, Arif Abdullazadə və başqaları ilə ünsiyyətdə olmağım ədəbiyyatşünaslıq elmi haqqında təsəvvürlərimi xeyli genişləndirdi. Aspiranturaya qəbul olmağımda da, müdafiə edib elmi dərəcələr almağımda da bu adamların bu və ya digər dərəcədə rolu olub. İndi onların hamısının ruhu qarşısında baş əyirəm.”

Təsadüfi deyildir ki, bu adlarını çəkə bildiyi və çəkmədiyi müəllimləri, həmkarları, qələm dostları, tələbələri belə, onun şəxsiyyəti və yaradıcılığı barəsində qiymətli fikirlər və mülahizələr söyləmişlər.

Fikrimizə, sübut kimi, bir sıra tanınmış ədəbiyyatşünaslarımızın, lap elə, adi oxucularının onun tədqiqatları barəsində yazdıqları, söylədikləri fikirlərindən bəzi nümunələri oxucularımızın nəzərinə çatdırmaq istərdik.

Tələbəsi Pərvindən başlayaq : ”... Azərbaycan Dövlət Pedaqoji Universitetinin magist-




ratura pilləsinə yeni daxil olduğumuz və qalibiyyət duyğusundan hələ ayılmadığımız vaxt idi. Özümüzü “balaca alim”, professorlarla həmkar sandığımız bir dövrdə Rafiq müəllim elə ilk dərsi ilə yumağa döndərmişdi bizi. Onun ruhu, aurası, biliyi, intellekti sanki hamımızı sehrləmişdi”.

Tələbəsi Aynur Çobanzadə: ”Hörmətli Rafiq müəllim, əvvəla Sizə öz adımdan dərin minnətdarlığımı bildirirəm ki, Rusiyada doğulub-böyümüş bir insana öz doğma ədəbiyyatımızı sevdirdiniz. Siz ”Ədəbiyyatşünaslığın əsasları” kimi gözəl bir dərslik işləyib hazırlamısınız. Nəzəriyyənin bütün incəliklərini öz kitabınızda əks etdirmisiniz. İnanın ki, bu, biz tələbələr üçün çox dəyərli bir kitabdır. Yəni ömürlük Sizdən bizə, bizdən də gələcək nəsilə bir xoş xatirə kimi qalacaq”.

Müəllif-müəllim üçün tələbə və oxucu məktubundan da qiymətli qeyri bir şey tanımıram

Elmi rəhbəri, filologiya elmləri doktoru, şair Qasım Qasımzadə: ”...Poemalarda xarakter məsələsinə estetik yanaşmada müəllifin millilik kateqoriyasını ön plana çəkib problemi realizm baxımından qimətləndirməsi, eləcə də obrazların nə dərəcədə koloritli verildiyini aydınlaşdırması baxımından maraqlıdır və yenidir. Onun olduqca zəhmətsevər və zəkalı olduğu qənatinə gəlmişəm”.

Filologiya elmlər doktoru, professor Əkbər Ağayev: ”Deyim ki, Rafiq bişmiş və ərsəyə gəlmiş, elmi-tədqiqatın nə demək olduğunu dərk etmiş hazırlıqlı kadrlardandır”.

Filologiya elmləri doktoru, şair Atif Zeynallı: ”Rafiq Yusifoğlu çətin və şərəfli bir vəzifənin öhdəsindən gəlmiş, Azərbaycan poeması, onun inkişaf problemləri haqqında sanballı, elmi maraq doğuran bir əsər yaratmışdır. O, işgüzarlığı, tədqiqatçılıq səriştəsi, bədii əsəri qiymətləndirmək bacarığı, təvazökarlığı ilə rəğbət qazanmışdır”.

AMEA-nın müxbir üzvü, filologiya elmləri doktoru, professor Yaşar Qarayev: ”Əzizim Rafiq! Monoqrafiyanı zövqlə, azalmayan bir maraqla oxudum. Xüsusən yaxın keçmişin böyük epik ənənəsinə verilən təhlil və qiymət metodoloji cəhətdən tarixi-elmi əhəmiyyət kəsb edir”.

Tanınmış ədəbiyyatşünas, filologiya elmləri namizədi, dosent Yaqub İsmayılov: ”Mən Rafiq Yusifoğlunu 30 ilə yaxındır ki, tanıyıram. Rafiq müəllim yüksək insani keyfiyyətlərə malik bir ziyalıdır, zəhmətkeş alimdir, istedadlı şairdir. Onun ”Azərbaycan poeması: axtarışlar və perspektivlər” monoqrafiyası, ali məktəblər üçün yazdığı ”Ədəbiyyatşünaslığın əsasları”, ”Müasir ədəbi proses və ədəbi tənqid”, ”Uşaq ədəbiyyatı” dərslikləri çox faydalı və praktik əhəmiyyəti olan əsərlərdir”.

Filologiya elmləri doktoru, professor Cəlal Abdullayev: ”Mən Rafiqin bir cəhətini daha çox sevirəm. O da nədir? Rafiq kimi özündən əvvəlkiləri ehtiramla yad edən, hər kəsin öz qiymətini verən ikinci bir adam tanımıram”.

Bu misalların sayını çoxaltmaq olar -- Təhsin Mütəllibov, Vaqif Arzumanlı, Nazif Qəhrəmanlı, Kamran Əliyev, Qurban Bayramov, Vəli Osmanlı, Şamil Vəliyev, Himalay Qasımov, Alxan Məmmədov, Vaqif Yusifli, Allahverdi Eminov və onlarla baçşqaları, ən müxtəlif nəsilləri əhatə edən tənqidçi və ədəbiyyatşünaslar R.Yusifoğlunun elmi yaradıcılığını yüksək qiymətləndirmişlər...

Mən də vaxtilə onun poema janrının sənətkarlıq xüsusiyyətlərinə həsr etdiyi elmi əsəri belə qiymətləndirmişəm: ”Bu Rafiq müəllimin yeganə işi deyildir: o bu mövzuda fundamental doktorluq işi yazmış, bir neçə monoqrafiya, dərslik, çoxlu sayda məqalə, məlumat, tədqiqat tipli yazılar çap etdirmişdir. Bu kitab, xüsusən XX əsrdə Azərbaycan poemasının bir çox nəzəri və sənətkarlıq xüsusiyyətləri haqqında ətraflı təsəvvür yaradır, janrın tədqiq tarixini, tipologiyasını və ənənələrə bağlılığını mövzu, süjet və problematika əlvanlığı, zaman və qəhrəman problemini, konflikt və xarakter məsələsinin qoyuluşunu bədii sənətkarlıq komponentləri işığında bədii portret, peyzaj, detal və bədii təsvir, ifadə vasitələrini, eləcə də poemanın vəzn və qafiyə sistemini əhatələyir”.

Bunları niyə nümunə gətirdim? Əvvəla, bu fikirlər Rafiq müəllimin bir alim kimi şəxsiyyəti, elmi yaradıcılığı, tarixə baxışı, ədəbi fikir siferasında tutduğu yeri dürüst müəyyənləşdirməklə yanaşı, ona müasir ədəbi-elmi mühitin münasibətini bildirir. Bu fikirləri bir cəhət xüsusən birləşdirir R.Yusifoğlunun istedadını, daima axtarışa meyilliliyini, mühüm və çətin problemlərin həllinə səriştəli və cəsarətli münasibətini, sadəliyini, təvazökarlığını və s. alim-ziyalıya məxsus yaxşı nə varsa onu ehtiva edir.

**(Davamı 6-cı səhifədə)**

# Ədəbi-nəzəri fikrin tədqiqi

(Əvvəli 5-ci səhifədə)

Sonra da R.Yusifoğlunun qarşımızdakı kitabının sonuncu, "Əlavə" adlandırdığı hissədə onun barəsində qələm dostlarının fikirlərini verməsi həm qədrşünaslıqdır, həm də maraqlı bir formadır ki, biz də həmin hissədən istifadə edərək öz münasibətimizi bildirdik.

Ümumiyyətlə, müəllifin "Ədəbi-nəzəri fikrin inkişaf mərhələləri" monoqrafiyasının mündəricatı zəngindir və müəyyən elmi-nəzəri, tarixi-xronoloji sistemlə tərtib edilmişdir. R.Yusifoğlunun bu kitabı-tədqiqatı da monumentallığı ilə seçilir. Ən qədim dövrdən bu günümüzə qədər ədəbi-nəzəri fikrin inkişafını mərhələlər üzrə izləmək, ümumiləşdirmək, qiymətləndirmək xüsusi hazırlıq və səriştə tələb eləyir.

Burada böyük və keşməkeşli, müxtəlif sosial-tarixi mərhələlərdən keçən, böyük tarixi dövrün məhsulu olan, müxtəlif nəzəri istiqamətləri əhatə edən, fərqli ədəbi-nəzəri üslublarda yazılan əsərlər, elmi-nəzəri baxışlar tədqiqata cəlb edilir, dünya nəzəri fikir kontekstində Azərbaycan ədəbi-nəzəri fikrinin təkamül yolu canlandırılır.

Tam aşkar görünür ki, müəllif Şərq və Qərb ədəbi-nəzəri fikrinin başlıca, əsas istiqamətlərini dərindən öyrənmiş, izləmiş, mövcud nəzəri ədəbiyyatdan sərf-nəzər etməmişdir. Fikrimizcə, müəllif qədim və orta əsrlərdən üzü bəri Şərq-Qərb ədəbiyyatşünaslığının, estetikasının, elmi-fəlsəfi təmayüllərin mühüm mənbələrinə istinadən, əslində, dünya ədəbi-nəzəri fikir tarixini yaradıbdır.

Monoqrafiya "Ön söz əvəzi" ilə başlayır və "Nəzəri fikrin təşəkkülü", "Orta əsrlərdə nəzəri fikir", "XIX əsrdə ədəbi-nəzəri fikir", "XX əsrdə ədəbi-nəzəri fikir", "Sovet dövründə ədəbi-nəzəri fikir", "Müstəqillik illərində ədəbi-nəzəri fikir", "Müsir dünyada nəzəri-estetik fikir" ümumi başlıqları altında yarımfəsiilərdə öz əsas məzmununu tapır,"Son söz əvəzi", "Ədəbiyyat siyahısı" və mündəricata düşməyən, lakin olduqca vacib olan "Əlavə"dən ibarətdir.

Məlumdur ki, ədəbi prosesin formalaşmasında mühit, sənətkar şəxsiyyəti, yaradıcılıq psixologiyası, varislik prinsipi mühüm əhəmiyyət kəsb edir. Görkəmli sənətkarların bədii söz və onun qanunauyğunluqları haqqında fikir və mülahizələri də böyük maraq doğurur və ümumən ədəbi-nəzəri fikrin formalaşmasında iştirak edir, stimul verir. Müəllif tədqiqatı boyu bu məsələləri nəzərdə saxlamış, müasir gənc filoloqlara dərslik səviyyəsində istiqamətverici bir əsər yazmış, ədəbi-nəzəri fikir nədir, necə formalaşır, nə cürə inkişaf edir və hansı mərhələlərdən keçmişdir kimi problematik sualları cavablandırmışdır.

O da məlumdur ki, ədəbi-nəzəri fikir ümumilikdə bədii əsərin ideyası, məzmun və forması, onun struktru, sujet və kompozisiyası, obrazlar sistemi, rəngarəng sənətkarlıq komponentləri, bədii təsvir və ifadə vasitələri, dil, eləcə də həyatı nə şəkildə əks etdirmənin prinsipləri haqqında düşüncələr sistemidir. R.Yusifoğlu səriştə göstərərək bütün bu sistemin elmi şərhini ortaya qoymuş, onun təkamülünü izləmiş və ümumiləşdirmişdir.

Zəhmətkeş tədqiqatçı eramızdan əvvəl Şərqdə Zərdüştün (e.ə. VII-VI əsrlər), Buddanın (e.ə.VI əsr), Lao Tszının (e.ə. VI əsr), Konfutsinin (e.ə.VI əsr), Yan Çyunun (e.ə.440-360), Çjuan Tszinin (e.ə. 369-286) və başqalarının, Avropa yaxasında - Yunanıstan və Romada Falesin (e.ə.625-547), Anaksaqorun (e.ə.500-423), Heraklitin (e.ə.540-480), Pifaqorun (e.ə.580-500), Zenonun ( e.ə. VI əsr), Empedoklın (e.ə.485-425), Sokratın (e.ə. 469-399), Demokritin (e.ə.460-350), Platonun (e.ə.428-347), Diogen Sinoplunun (e.ə.404-323), Fukudidin (e.ə.460-400), Aristotelin (e.ə.384-322), Epukurun (e.ə.342-271), Siseronun (e.ə.106-43), Lukretsi Karın (e.ə. 99-55), Senekanın (4-65), Epiketin (50-138), Mark Avrelinin (121-180) və başqalarının fikirlərini bir daha, yenidən izləmiş, antik dövrün fikir adamları ilə müasir gənc oxucusunu, tələbələrini tanış etmiş və düzgün olaraq o qənaətə gəlmişdir ki, bu nəhəng insanların fikirləri həm insanların dünyanı dərkinə, yaşam tərzlərinə, həm də onların yaradıcı təxəyyüllərinin yeni istiqamətdə inkişafına təkan vermişdir.

Xüsusən, R.Yusifoğlu bu konsepsiyanı izləyərkən, həmişə Avropa ədəbiyyatşünaslarının daha çox üstünlük verdikləri "avrosentrizm"dən uzaqlaşmış, həqiqiəti ortaya qoyaraq ta qədimdən dünya ədəbi-nəzəri fikrinin formalaşmasında obyektiv ilkinliyi, başlanğıcı Şərqdən götürmüş, Avestaşünaslığa, Şumerşünaslığa, Qədim Çin təfəkkürünə, Buddizmə, prototürk dastançılıq ənənələrinə diqqəti cəlb etmiş, inandırıcı arqumentlərlə, zəngin misallarla, mənbələrə əsaslanaraq konsepsiyasını ortaya qoymuşdur.

Belə ki, monoqrqfiyada Şərq poetikasının türk, ərəb, farsdilli ədəbiyyatın minillik ədəbi təcrübəsinə istinadən yaradılan mükəmməl bir nəzəri sistem izlənilir, bu sistemin yaradıcılarından olan Sibaveyh, İbn Quteybə, Qudamə ibn Cəfər, Əbdülqahir Curcani, Eynülqüzzat Həmədani, Şeyx İşraq, Əl-Fərabi, Nəsirəddin Tusi, Kami Qəzvini, bəlağət elminin banisi sayılan Cahiz və başqaları haqqında verilən məlumatlar, onların fikir və mülahizələrindən gətirilən sitatlar həm Şərq poetikasının görkəmli nümayəndələri, həm də bu poetikanın nəzəri-estetik prinsipləri, kateqoriyaları haqqında dolğun təsəvvür yaradır.

Burada bir cəhəti də qiymətləndirmək gərəkdir ki, R.Yusipoğlu fikirlərini sübuta yetirmək üçün Qərb və Şərq mənbəşünaslığı ilə yanaşı və bəlkə də, bir az da, üstünlüklə Azərbaycan mənbəşünaslığından istifadə etmiş və bununla da ədəbi-nəzəri fikrin təkamülündə Azərbaycan ədəbiyyatşünaslığının nəticələrini önə çəkərək qiymətləndirmişdir.

R.Yusifoğlunun bu əsərinin ən maraqlı konseptual xətlərindən biri də ədəbi-nəzəri fikrin formalaşmasında təkcə nəzəri fikir adamlarının deyil, klassik, görkəmli sənətkarların roluna da, əhəmiyyətli bir dərəcədə izləməsidir. Bu hissədə Xətib Təbriziznin, Nizami Gəncəvinin, Məhəmməd Füzulinin poetik və bədii əsərlərinə, divanlarına yazdıqları dibaçələrə əsaslanaraq onların ədəbi-nəzəri görüşlərinin məğzi konseptual şəkildə açıqlanır, İntibah (resenans) dövrünün, Sufizm - təsəvvüf və hurifizmin bu yöndən mahiyyəti açıqlanır, orta əsrlər nəzəri fikrinin mühüm abidələrindən olan Bualonun "Poeziya sənəti" əsəri qiymətləndirilir.

R.Yusifoğlu xronoloji ardıcıllıqla XIX və XX əsrlərdə təkamül edərək formalaşan dünya ədəbi-nəzəri fikrinin nəhənglərindən olan V.Q.Belinskinin, Jül Renarın, M.F.Axundzadənin, sonrakı əsrdə A.Səhhətin, M.Ə.Sabirin, Y.V.Çəmənzəmənlinin ədəbi-nəzəri görüşlərindən söhbət açır.

Monoqrafiyanın ən maraqlı və geniş hissələrindən biri də "Sovet dövründə ədəbi-nəzəri fikir" başlığı altında verilən oçerklərdir. Bura qədər olan fikir və mülahizələrdə ədəbi-nəzəri fikrin inkişafı dünya miqyasında klassik tarixi müstəvidə izlənilirdisə, bu fəsildə lokal bir tarixi-siyasi mərhələ - Sovet dövründəki ədəbi-nəzəri fikirin Azərbaycan ədəbi mühitindəki mahiyyəti şərh edilir. Mühüm məsələ odur ki, bu mərhələ ilk dəfədir ki, belə bir problematika istiqamətində öyrənilir.

Müəllif bu mərhələni izləmək üçün Azərbaycan ədəbiyyatşünaslığının elmi istiqamətlər üzrə əldə etdiyi nəticələrə ümumi baxış edir, Sovet dövrü ədəbiyyatşünaslıq elmimizin ümumi mənzərəsini canlandırır, əldə edilən nailiyyətləri ədəbi faktlar əsasında xatırladır və bunların ədəbi-nəzəri fikrin mühüm qaynaqları sayır. Və sonrakı yarı fəsillərdə bu nailiyyətlərdən bacarıqla istifadə edə bilir.

R.Yusifoğlu burada Firudin bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı" kitabını təhlilə cəlb edir və olduqca əhatəli şəkildə görkəmli maarifpərvər ziyalımız, ədəbiyyat tarixçimiz Firudin bəy Köçərlinin bu sahədəki xidmətlərini faktların dili ilə şərh eləyir, nəzəri fikir tariximizdə ilk dəfə bu nəhəng ədəbiyyat adamının ədəbiyyatımızın elmi təsnifatını verməsini müəyyənləşdirərək yazır: "Həm ədəbiyyat, həm mənəviyyat, həm də ədəbi-nəzəri fikir tariximizin formalaşmasında F.Köçərlinin müstəsna xidmətləri olmuşdur. İlk dəfə olaraq o, xalqın diqqətini öz mənəviyyat, ədəbiyyat tarixinin üstünə yönəltmiş, millətin özünü özünə tanıtmaq cəhdi göstərmişdir. Bu əsərlə F.Köçərli ilk sistemli ədəbiyyat tariximizi yaratmış, ədəbiyyatşünaslıq elmimizin bünövrəsini qoymuş, onun nəzəri-estetik prinsiplərini formalaşdırmış, humanitar elmin inkişaf perspektivlərini müəyyənləşdirmişdir".

Yeri gəlmişkən qeyd edək ki, F.Köçərlinin bu əsərinin ilk variantı 1903-cü ildə rus dilində nəşr olunmuş və böyük rəğbətlə qarşılanmışdır. F.Köçərli sonralar, yəni XX əsrin ilk on illiyi boyu bu işi davam etdirərək 2 cildlik "Azərbaycan ədəbiyyatı kitabı"nı yaratmış, həmin dövrdə bu əsərini kitab şəklində çap etdirə bilməmişdi. F.Köçərlinin bu monumental əsəri mətinşünas Ruqiyyə Qəmbərqızının tərtibi və şərhləri ilə Sovet dövründə - 1978-ci ildə 1-ci cildi, 1981-ci ildə 2-ci cildi nəşr edilmişdir.

Məncə, R.Yusifoğlu XX əsrin əvvəllərinin ədəbi-nəzəri fikrinin məhsulu olan bu məşhur tarixi abidəni nəşr tarixinə görə "Sovet dövrü ədəbi-nəzəri fikir" bölməsinə salmalı deyildi. F.Köçərlinin bu kitabı XX əsrin əvvəlləri ədəbi-nəzəri fikir" fəslində yerləşdirilməli idi.

R. Yusifoğlu bu yarımfəsildən sonra "Azərbaycan sovet ədəbiyyat və sənət haqqında fikir və mülahizələri" yarımfəslini təqdim etmişdir. Burada, tədqiqatçı düzgün olaraq, belə bir mülahizə irəli sürür ki, "ədəbi-nəzəri fikrin formalaşmasında görkəmli ədəbiyyatşünas alimlərlə yanaşı, şair və yazıçıların xidmətləri az olmamışdır" və bu mülahizə prizmasından ümumiləşmiş elmi baxışla yanaşı, H.Cavidin, M.Müşfiqin, xüsusən C.Cabbarlının nəzəri görüşlərinə bir yerdə diqqət yetirir, sonra isə ayrı-ayrılıqda Səməd Vurğunun, Süleyman Rəhimovun, Mehdi Hüseynin, Mirzə İbrahimovun, Rəsul Rzanın, Mir Cəlalın ədəbi-nəzəri görüşlərini təhlil süzgəcindən keçirir, Sovet dövründə yaranan nəzəriyyə dərsliklərinin elmi mahiyyətindən, dəyərlərindən, perspektivlərindən söhbət açır.

R.Yusifoğlunun bu tədqiqatının ən maraqlı, daha çox orjinal təsir bağışlayan "Müasir dünyada nəzəri-estetik fikir" fəslidir. Burada zəhmətkeş və daima axtarışlarda olan tədqiqatçı "Modernizm və onun nəzəri-estetik prinsipləri", "Semiotika nəzəriyyəsi", "Postmodernizm və onun nəzəri-estetik prinsipləri" təkin müasir, konseptiual, olduqca aktual, müasir nəzəri fikrin maraq dairəsində intensiv şəkildə olan problemləri izah və şərh eləmiş, özünün münasibətini bildirmişdir.

Monoqrafiyanın elmi baxımdan zənginliyi və mövcud mənbələrə müstəqil yanaşma üsulu bunu tam şəkildə sübuta yetirir. Mövzunun əhatə miqyası tarixin dərinliklərindən bu günümüzə gəlir və bunları əhatə etmək elə də asan məsələ deyildir. Bu dövrün ədəbi-nəzəri fikir materialı müəllifin elmi laboratoriyasında təhlil-təşrih əməliyyatından keçərək dürüst qiymətini tapmışdır.

Ümumilikdə, kitabın-monoqrafiyanın elmi planı, struktru və elmi-nəzəri materialın əhatəsi qənaətbəxşdir. Elmi araşdırma aydın, məntiqli və məqsədlidir. Monoqrafiyada ədəbi-nəzəri fikrin inkişaf mərhələləri ayrı-ayrı fikir adamlarının nəzəri fikir müstəvisində ən maraqlı detallarına qədər bütün sənətkarlıq komponentləri diqqət mərkəzinə çəkilmişdir. Klassik üslubda yazılmış, müasir və qabaqcıl ədəbiyyatşünaslıq ənənələrimizi davam və inkişaf etdirən bu əsər öz əhatəliliyi, monumentallığı, informasiya zənginliyi, elmi səviyyəsi ilə diqqəti cəlb edir.

Professor R.Yusifoğlu ədəbiyyatımızda öz sözü, öz imici olan nüfuzlu qələm sahiblərimizdəndir. Onun "Ədəbi-nəzəri fikrin inkişaf mərhələləri" kitabı müasir elmi-nəzəri fikrin bütün tələblərinə və parametrlərinə cavab verməklə yanaşı, ümumiyyətlə, dünya ədəbi fikrinin təkamülü barəsində dürüst, obyektiv təsəvvür yaradan monumental tədqiqatdır.

Əsəri oxuduqca aşkar şəkildə görünür ki, müəllif ədəbi-nəzəri fikir tarixini mükəmməl şəkildə mənimsəmiş, həmçinin, hər dövrə məxsus fikir axınını, cərəyanları, bunların tarixi mənzərəsini yaxşı bilir. Elə buna görə də müəllifin elmi-nəzəri arqumentləri, izah və şərhləri inandırıcıdır və hər bir müddəanın arxasında fakt dayanır, material dayanır, müəlliflərin fikirlərindən gətirilən misallar dayanır.

Əsəri oxuyarkən dünya ədəbi-nəzəri fikrinin inkişaf yolu, onun təkamülü, əldə olunan, sivlizasiya xidmət edən nəticələri barəsində tam təsəvvür yaranır və elə buna görə də R.Yusifoğlunun bu yeni tədqiqatını müasir ədəbiyyatşünaslığımızın nailiyyətləri səviyyəsində qəbul etmək olar. Çünki Rafiq müəllim bu əsərini də müasir milli metodologiya və mütərəqqi dünya ədəbiyyatşünaslığının zəngin təcrübəsi və nəzəri prinsipləri əsasında araşdırdığından dəyərli və orjinal, bu günümüzə-filoloji nəzəri fikrimizə, tədrisimizə, təhsilimizə lazımlı, boşluğu dolduran bir monoqrafiya yarada bilmışdır.

Filologiya üzrə elmlər doktoru, professor, şair, tərcüməçi, publisist, ədəbiyyatşünas, pedaqoq R.Yusifoğlu olduqca məhsuldar ziyalılarımızdandır. Hələ beş il bundan əvvəl nəşr edilmiş biblioqrafik göstəricidə onun yaradıcılığı barəsində 3592 addan ibarət məlumat verilmişdir. Bu adi fakt deyildir, mühüm göstəricidir, qürur və fərəhverici göstəricidir və bu faktlar sübut edir ki, R.Yusifoğlu bu günümüzün ən nüfuzlu qələm sahiblərindən biridir. Bir qələm dostu və həmkarı kimi ona bu yolda yeni-yeni uğurlar arzulayıram.



**Tərlan Novruzov,**
**Dünya ədəbiyyatı kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru, professor, Əməkdar müəllim**

## ADPU-nun Zaqatala filialında Azərbaycan Ordusuna dəstək aksiyası keçirildi

Aprel ayının 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Zaqatala filialında Azərbaycan Ordusuna dəstək aksiyası keçirilmişdir.

ADPU-nun Zaqatala filialının professor-müəllim, tədris-köməkçi və tələbə heyətinin iştirak etdiyi izdihamlı aksiyanı giriş sözü ilə filialın direktoru, professor Orucəli Rzayev açmışdır. Professor O.Rzayev bildirmişdir ki, son günlər ön cəbhədə gərginləşən və-




ziyyəti hamımız müşahidə edir, Azərbaycan Ordusunun qalibiyyət xəbərlərini izləyirik. Biz həm sevinir, həm də kədərlənirik. Sevinirik ona görə ki, cəsur oğullarımız düşmənə layiqli cavab verərək uğurlu hərbi əməliyyatlar həyata keçirirlər. Kədərlənirik ona görə ki, qurbanlar veririk. Həmin qurbanlardan ikisi məhz bu rayonun-Zaqatala rayonunun igid övladlarıdır. Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyev başda olmaqla, ordumuz yenilməzdir, gündən-günə güclənir, rəşadət və igidliklər göstərir.

ADPU-nun Zaqatala filialının Tədris və tərbiyə işləri üzrə direktor müavini, dosent, Ağdam rayonunun işğalı nəticəsində məcburi köçkün düşmüş Həqiqət Qədimova, Təbiət fənlərinin tədrisi metodikası kafedrasının dosenti, Ağdam rayonundan məcburi köçkün düşmüş Arif Əzimov, tələbələrdən Laçın və Şuşa rayonlarından məcburi köçkün düşmüş ailələrinin övladları, filialın "İbtidai sinif müəllimliyi" ixtisası üzrə III kurs tələbəsi Rəqsanə Cahangirova və "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisası üzrə III kurs tələbəsi Sərxan Boranlı çıxış edərək mənfur düşmənin onların özlərinə və ata-babalarına çəkdikləri ömürlük yaradan qəzəblə söhbət açmış, lakin bu gün mətin əsgərlərimizin artıq bu qanı yerdə qoymadıqlarının şahidi olmalarından qürur duyduqlarını bildirmişlər.

Sonra aksiya iştirakçıları ümumrayon toplantısına qatılmaq üçün şəhərin mərkəzi meydanına yollanmış-



lar. Ümumrayon mitinqində ruh yüksəkliyi, qələbələrimizdən doğan qürur, iftixar və vətəndaşlıq arzuları ilə iştirak etdikdən sonra filialın professsor - müəllim, tədris -köməkçi heyəti və tələbələrin böyük bir hissəsi bir neçə gün əvvəl şəhidlik zirvəsinə ucalmış 19 yaşlı Rəvan Qaçayevin məzarını ziyarət etmək üçün onun doğulduğu Muxax kəndinə getmişlər. Kollektiv üzvləri şəhidin uyuduğu kənd qəbristanlığına gələrək cəsur Azərbaycan övladının məzarı önünə əklillər qoymuş və tər çiçək dəstələri düzmüşlər.

## ADPU-nun Qazax filialında Azərbaycan Silahlı Qüvvələrinə dəstək aksiyası keçirildi

5 aprel 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qazax filialında Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə bağlı son günlər cəbhə bölgəsində yaranmış vəziyyətlə əlaqədar Azərbaycan Silahlı Qüvvələrinə dəstək aksiyası keçirildi.




Dəstək aksiyasında ADPU-nun Qazax filialının professor-müəllim heyəti və tələbə-gəncləri iştirak etdilər. Aksiya Üzeyir Hacıbəylinin "Koroğlu" uvertürasının səsləndirilməsi ilə başlandı. Aksiyada ilk olaraq cəbhə bölgəsində şəhid olan hərbçilərimizin və dinc mülki vətəndaşların xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

ADPU-nun Qazax filialının direktoru, dosent Afaq Qasımova aksiyanı giriş sözü ilə açaraq bildirdi ki, son bir neçə gündə ordumuzun uğurlarına, bir neçə yüksəkliyin alınmasına sevinirik, qürurlanırıq və bu münasibətlə başda Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyev olmaqla, xalqımızı təbrik edirik. Direktor A.Qasımova öz çıxışında filial əməkdaşdaşlarını, eləcə də tələbələri ordumuza dəstək olmağa çağırdı.

Aksiyada filialın direktor müavini, dosent Məmməd Yusifov, müəllimlərdən Hamlet İlyasov, Heyran Vəkilova, İradə Arıxova öz çıxışlarında bildirdilər ki biz həmişə dövlətimizə, ordumuza dəstək olmağa hazırıq. Qoy Azərbaycan Ordusunun uğurları çox olsun, qələbə bizimlə olsun!

Aksiyada "Yaşasın Azərbaycan!", "Qarabağ bizimdir!", "Ar olsun ermənilərə!" şüarları səsləndirildi. Aksiya Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə sona çatdı.



# ADPU-nun Ağcabədi filialında orduya dəstək mitinqi keçirildi

5 aprel 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi filialında Vətən torpaqları uğrunda mübarizəyə qalxmış oğullarımıza dəstək mitinqi keçirildi. Mitinqdə filialın professor-müəllim heyəti ilə yanaşı, rayon ictimaiyyətinin və kütləvi informasiya vasitələrinin nümayəndələri də iştirak edirdilər.

ADPU-nun Ağcabədi filialının direktoru, dosent Mətanət Fərzəliyeva mitinqi giriş sözü ilə açaraq bildirdi ki, düşmənə qarşı irəliləməkdə olan nizami ordumuz Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi altında rəşadətlə döyüşür. Sevindirici haldır ki, həm ön, həm də arxa cəbhədə böyük ruh yüksəkliyi, mənəvi birlik hökm sürməkdədir. Xalq öz rəhbərinə, öz dövlətinin artan gücünə inanır və qələbə əzmi ilə yaşayır.

Sonra çıxış üçün söz filialın dosenti Məhəmməd Hüseynova verildi. O, bildirdi ki, artıq ötən 4 gün ərzində bir neçə strateji əhəmiyyətli yüksəkliklər işğaldan azad edilib və Azərbaycan Ordusu qələbə əzmi ilə döyüş ruhumuzu durmadan yüksəldir.

Xalqımızın qeyrətli oğulları öz qanları, canları bahasına da olsa, Vətən torpaqlarını işğaldan azad edəcəklərinə and içmişlər. Dogma Azərbaycanımızın artan gücü özünü hərbi sahədə daha çox büruzə verir. Ən son hərbi texnika ilə təchiz olunmuş ordumuzun müharibəni qələbə ilə sona çatdıracağından əminik.





Mitinqdə çıxış edən filialın digər əməkdaşları - dosent Seymur Süleymanov, tarix üzrə fəlsəfə doktoru, baş müəllim Əlizadə Nəcəfov, baş müəllimlər Səfurə Mahmudzadə, Fəridə Mikayılova, Qərənfil Rzayeva bildirdilər ki, doğrudur, müharibə dəhşətdir, ölüm və qan gətirir, lakin bütün bunlara baxmayaraq, biz müharibənin dəhşətlərindən qorxmuruq.Biz milli qürur, milli qeyrət naminə bir araya gəlib döyüşü alın yazımıza çevirmişik. Neçə illərdir, arzusunda olduğumuz qisas günü yetişmişdir. Düşməni öz yerində oturtmağın vaxtı gəlmişdir. Gəlin, Vətən torpaqlarımızı müdafiəyə qalxmış qeyrətli oğullarımıza dəstək olaq və var gücümüzlə Xocalının, 20 Yanvar faciəsi qurbanlarının günahsız axıdılan qanlarının hesabını soraq.

Filalın tələbə-gənclərindən Mina Fətəliyeva, Eltac Fərzəliyev və başqaları çıxış edərək bildirdilər ki, bir Vətən övladı olaraq səngərlərdə dayanmağa və igid oğullarımızla bir cərgədə döyüşə hazırıq.

Mitinq ""Eşq olsun Azərbaycan Silahlı Qüvvələrinin Ali Baş Komandanı cənab İlham Əliyevə!"Mənfur düşmən, torpaqlarımızdan rədd ol!", "Qələbə bizimlədir!", "Eşq olsun Vətənimizin igid oğullarına!", "Eşq olsun igid oğullar doğan analara!", "Qələbə, qələbə və yalnız qələbə!" şüarları ilə yekunlaşdı.

# ADPU-nun Şəki filialında orduya dəstək mitinqi keçirildi

Aprel ayının 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında Milli Ordumuzun son günlər işğal olunmuş cəbhəyanı ərazilərdə apardığı uğurlu hərbi əməliyyatlara həsr olunmuş mitinq keçirilmişdir. Əvvəlcə ağır döyüşlərdə şəhid olmuş soydaşlarımızın əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilmiş, Azərbaycanın Dövlət Himni səsləndirilmişdir.



Mitinqdə çıxış edənlər - ADPU-nun Şəki filialının direktoru Rafiq Rasulov, direktor müavini Nuralı Çələbiyev, Şəki şəhəri Böyük Vətən müharibəsi, Əmək və Silahlı Qüvvələr Şurasının sədri Mustafa Əhmədov, kafedra müdiri Firədun İbrahimov, geoloq-alim Hüseyn Mustafabəyli, tarixçi Həbibullah Manaflı və "Tarix və coğrafiya müəllimliyi" ixtisasının III kurs tələbəsi, Tələbə Gənclər Təşkilatının sədr müavini Rəşad Sadıqov bildirmişlər ki, öz haqq işi, dövlətimizin ərazi bütövlüyü uğrunda mübarizəyə qalxan qüdrətli Azərbaycan Ordusu son günlər mənfur düşmənlərin mövqelərinə ağır və sarsıdıcı zərbələr endirməklə onları tələfata uğratmış, düşmən böyük itkilər verərək bir çox mövqeləri tərk etməyə məcbur edilmişdir. Cəbhədən gələn və hər an yenilənən qələbə müjdəli xəbərlər hər birimizi sevindirir, Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin ətrafında daha sıx birləşməyə səfərbər edir. İndi hər birimiz vətəndaş olaraq öz birliyimizlə, fəaliyyətimizlə ordumuza və dövlətimizə hər an dayaq olmalıyıq. Lazım gələn hər bir anda öz əməli köməyimizi əsirgəməyərək vətəndaşlıq borcumuzu ləyaqətlə yerinə yetirməliyik.

# ADPU-nun Cəlilabad filialında orduya dəstək məqsədilə "Vətən bölünməz! Şəhidlər ölməz!" adlı aksiya keçirildi

Aprel ayının 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad filialında ordumuza dəstək məqsədilə "Vətən bölünməz! Şəhidlər ölməz!" adlı aksiya keçirildi. Aksiyada ADPU-nun Cəlilabad filialının rəhbərliyi, professor-müəllim heyəti, Cəlilabad Rayon İcra Hakimiyyəti (RİH) başçısının müavini Vidadi Dövlətov, Qarabağ müharibəsi veteranı Maşallah Əliyev, şəhid Ataşlı Zülfüqar Vəli oğlunun atası Vəli Ataşov, filialda təhsil alan tələbələr və kütləvi informasiya vasitələrinin nümayədələri iştirak etdilər.



Aksiya şəhidlərimizin xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlandı, sonra isə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi. ADPU-nun Cəlilabad filialının direktoru, dosent Xudayar Sultanlı çıxış edərək tələbə-gəncləri Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin ətrafında sıx birləşməyə çağırdı.

Qarabağ müharibəsi veteranı Maşallah Əliyev aksiyada çıxış edərək xalqımızı əldə etdiyimiz uğurlar münasibətilə təbrik etdi və alınan ərazilərin strateji əhəmiyyətindən danışdı.

Şəhid atası Vəli Ataşov çıxış edərək şəhidlərimizə Allah-Taaladan rəhmət dilədi, eyni zamanda şəhidliyin uca zirvə olduğunu və şəhid atası olmasından qürur duyduğunu söylədi.

Aksiya tarix ürə fələsəfə doktoru Məmmədhəsən Əliyevin qəhrəmanlıq tariximizlə bağlı çıxışı ilə davam etdi.

ADPU-nun Cəlilabad filialının direktor müavini Eyvaz Məmmədov çıxış edərək ordumuzun son günlər cəbhədə əldə etdiyi uğurlardan danışdı. Bildirdi ki, bu gün əldə etdiyimiz hər bir uğur ulu öndər Heydər Əliyevin müdrik siyasi kursunu Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin çox uğurla həyata keçirməsinin nəticəsidir. Dövlət başçımız İlham Əliyevin qətiyyətli addımları bizi böyük qələbəyə aparır.



Aksiyada tələbələrdən Milana Canızadə, Çinarə Rufullayeva, Simran Əlizadə, Rəmalə Rəhimli, Gülzar Salmanova, Həmidə Mirizadə, Eltun Adıgözəlov, Murad Yusubzadə vətənpərvərlik mövusunda şeirlər səsləndirdilər və xalqımızı qələbəyə səsləyən çıxışlar etdilər. Tələbələr şüarlar səsləndirərək əsgərlərimizə dəstək verdilər və Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin ətrafında sıx birləşdiklərini, Vətən uğrunda canlarını həmişə fəda etməyə hazır olduqlarını bildirdilər. Aksiyada hərbi vətənpərvərlik mahnıları səsləndirildi.

Aksiyanın sonunda filialın bütün əməkdaşları və tələbələri bayraqlar və şüarlarla yürüş edərək Cəlilabad RİH tərəfindən təşkil olunmuş aksiyaya qoşuldular.

# Ali məktəb tələbələrinin ümummilli lider Heydər Əliyevin anadan olmasının 93-cu ildönümünə həsr olunmuş bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi



Müstəqil Azərbaycan dövlətinin banisi və qurucusu, ümummilli liderimiz Heydər Əliyev demişdir: "Xalqımızın zəngin mədəni irsi, yüksək milli-mənəvi dəyərləri, gözəl adət-ənənələri onun ən böyük sərvətidir". Əminliklə deyə bilərik ki, ulu öndər Heydər Əliyev yüksək milli-mənəvi dəyərlərimizin qorunmasında, onların dövlətçiliyimizin ayrılmaz tərkib hissəsinə və bu dəyərlərin təbliğ edilməsinin dövlət siyasətinin əsas istiqamətlərindən birinə çevrilməsində böyük rol oynamışdır. Qeyd edək ki, Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin birgə müvafiq qərarı əsasında hazırda ulu öndər Heydər Əliyevin anadan olmasının 93-cü ildönümü münasibətilə respublikamızın ali məktəb tələbələri arasında bədii yaradıcılıq festivalı keçirilir. Bu bədii yaradıcılıq festivalının keçirilməsində əsas məqsəd tələbə-gəncləri milli vətənpərvərlik, adət-ənənələrimizə, mədəniyyətimizə, incəsənətimizə hörmət ruhunda tərbiyə etmək, onların bədii-estetik səviyyəsini yüksəltmək, mədəni həyat tərzinin formalaşdırılması işinə kömək etmək, həmçinin incəsənət və mədəniyyətimizin ayrı-ayrı sahələri üzrə istedadlı gənclərin üzə çıxarılaraq onların qabiliyyətlərinin inkişaf etdirilməsinə dəstək verməkdir. Festivalın keçirilməsi üçün 5 nəfərdən ibarət Təşkilat Komitəsi və tərkibinə xalqımızın tanınmış incəsənət və mədəniyyət xadimlərinin daxil edildiyi 6 nəfərdən ibarət Münsiflər Heyəti yaradılmışdır.



Festivalda ölkəmizin bütün dövlət və qeyri-dövlət ali məktəblərinin tələbələri iştirak edirlər. Aprel ayının 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi keçirilmişdir. Baxış-müsabiqəsində ADPU-nun tələbələrinin yüksək səviyyədə ifa etdikləri şeir və musiqi nömrələri diqqəti cəlb etmişdir. Qeyd edək ki, festival qaliblərinin yekun konsertinin bu il may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur. Qaliblər Təhsil Nazirliyinin və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin diplom və hədiyyələri, mükafatları ilə təltif ediləcəklər.

**"Gənc müəllim"**

# ADPU-nun Şamaxı filialında "Qələbə bizimlədir!" devizi altında tədbir keçirildi

Aprel ayının 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialinda "Qələbə bizimlədir!" devizi altında tədbir keçirildi. Tədbirdə ilk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi.




ADPU-nun Şamaxı filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova tədbiri giriş sözü ilə açdı, torpaqlarımızın azadlığı uğrunda şəhid olan əsgərlərimizin ruhu bir dəqiqəlik sükutla yad edildi. Direktor T.Yusifova bildirdi ki, bu gün hər bir Azərbaycan vətəndaşı torpaqlarımızın azad olunması üçün bir yumruq kimi birləşir. Bu, torpağa olan böyük məhəbbətin gücüdür. Bu, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə olan inamın, ümumxalq sevgisinin gücüdür.




Bunun qarşısında dayana biləcək güc yoxdur. Azərbaycan torpaqları müvəqqəti işğal altındadır. Amma bu hadisələr bir daha onu göstərir ki, Azərbaycan torpaqlarının işğal altında qalması uzun sürməyəcək. Çox yaxın zamanlarda hər bir Azərbaycan vətəndaşı qələbəni duyacaq və onu qeyd edəcək. Tezliklə Azərbyacan bayrağı Şuşada, Laçında, eləcə də işğal altında olan bütün torpaqlarımızda dalğalanacaq.

Sonra çıxış edən filial əməkdaşlarından Mayıl Alcanov, Çingiz Dadaşov, əsgər anası Münəvvər Məmmədova, tələbələrdən Şirin Qarabağlı, Rövşanə Quliyeva, Heydər Sadıqov, Nurlan Mustafayev öz çıxışlarında qələbəyə inam, düşmənə isə nifrət hisslərini ifadə etdilər.

Tələbə-gənclər əllərindəki bayraqlar və qələbə ruhlu şüarlarla lazım gələrsə, ön cəbhədə vuruşmağa hazır olduqlarını bildirirdilər.

Onu da qeyd edək ki, aprelin 4-də Şamaxıda rayon ictimaiyyəti nümayəndələrinin Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Təhlükəsizlik Şurasının iclasındakı çıxışı və cəbhə bölgəsində baş verən hadisələrlə əlaqədar xalqa müraciətinə həsr olunmuş toplantısı keçirilmişdir. Toplantıda ADPU-nun Şamaxı filialının professor-müəllim və tələbə heyəti iştrak etmiş, Heydər Sadıqov bütün tələbələr adından çıxış edərək bir gənc kimi Vətənin müdafiəsinə hazır olduqlarını birdirmişdir.

# ADPU-nun Şəki filialının tələbələri ABŞ-ın Prezident Administrasiyasına ünvanlanan petisiyada fəal iştirak etmişlər

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialının tələbələri Azərbaycanda Vətəndaş Cəmiyyətinin İnkişafına Yardım Assosiasiyasının (AVCİYA) ABŞ Prezidentinə müraciətinə qoşularaq Azərbaycanın haqq səsini dəstəkləməklə Ermənistan tərəfindən işğal edilmiş tarixi ərazilərimizin geri qaytarılmasına ünvanlanan çağırışlara dəstək vermişlər. Filialın 200 nəfərdən çox tələbəsi həmin petisiyada qeydiyyatdan keçərək Ermənistan tərəfindən işğal edilmiş Azərbaycan torpaqlarının azad edilməsi və bölgədə humanitar fəlakətin qarşısının alınmasına yardım etmək çağırışlarına qoşularaq Azərbaycanın haqq səsini müdafiə etmiş və ABŞ-ın Prezident Administrasiyasından bu məsələnin ədalətli həllini xahiş etmişlər.

# ADPU-nun Şamaxı filialında “Heydər Əliyev və Azərbaycan gəncliyi” adlı tədbir keçirildi



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında ümummilli lider Heydər Əliyevin anadan olmasının 93-cü ildönümünə həsr olunmuş Tədbirlər planı hazırlanmışdır. Tədbirlər planına əsasən filialda silsilə tədbirlər keçirilir. 7 aprel 2016-cı il tarixdə filialın professor-müəllim və tələbələrinin iştirakı ilə “Heydər Əliyev və Azərbaycan gəncliyi” adlı tədbir keçirildi. Tədbir iştirakçıları əvvəlcə ulu öndər Heydər Əliyevin Şamaxı rayon mərkəzində yerləşən abidəsini ziyarət etdilər, gül dəstələri düzdülər.

Tədbiri filialın direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova dahi öndər Heydər Əliyevin bu müdrik kəlamı ilə açdı:

“Hər bir xalq özünün xoşbəxt gələcəyə olan ümidlərini ilk növbədə, gənc nəsilə bağlayır. Gənc nəslin vətənpərvərlik ruhunda tərbiyə olunması onun mənsub olduğu xalqın rifahının, ölkənin çiçəklənməsinin rəhnidir. Bu gün iftixar və qürur hissi ilə bildirmək istəyirəm ki, müasir Azərbaycan gəncliyi milli-mənəvi dəyərlərimizi, doğma ana dilimizi, ata-babalardan qalan gözəl adət-ənənlərimizi göz-bəbəyi kimi qoruyub yaşadır”.

Sonra filialın dosenti Vahid Xanalıyev, tarix üzrə fəlsəfə doktoru, dosent Mayıl Alcanov, baş müəllim Firidə Mustafayeva çıxış edərək bildirdilər ki, Azərbaycan gənclərinin günümüzün müasir, inkişaf etmiş, yüksək intellektli aparıcı qüvvə kimi formalaşmasında birmənalı olaraq dövlətmizin apardığı gənclər siyasətinin mühüm rolu olmuşdur. Bu siyasətin banisi isə xalqımızın böyük oğlu Heydər Əliyevdir. Ulu öndər Heydər Əliyevin gənclər siyasəti əsrlər boyu xalqımızın malik olduğu milli-mənəvi dəyərlər əsasında, müstəqillik, dövlətçilik, azadlıq və onların qorunması uğrunda mübariz ruhlu gənc nəslin yetişdirilməsindən ibarət olub. Ulu öndər Heydər Əliyevin Azərbaycan gəncliyinə göstərdiyi qayğı və diqqət hər zaman özünü göstərməkdədir.

Tədbirdə iştirak edən tələbə-gənclər də ulu öndər Heydər Əliyevin uzaqgörən və müdrik siyasətini mükəmməl öyrənəcəklərini bildirdilər.

# ADPU-nun Qazax filialında “Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan” mövzusunda elmi-praktik konfrans keçirildi



Aprel ayının 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qazax filialında xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 93-cü ildönümünə həsr olunmuş “Heydər Əliyev ideyaları işığında inkişaf edən və yüksələn Azərbaycan” mövzusunda elmi-praktik konfrans keçirildi. Elmi-praktik konfransı ADPU-nun Qazax filialının direktoru, dosent Afaq Qasımova giriş sözü ilə açdı. Direktor A.Qasımova xalqımızın milli xilaskarı, müstəqil dövlətimizin memarı və qurucusu, ümummilli lideri Heydər Əliyevin çoxşaxəli və çoxcəhətli idarəçilik və dövlətçilik fəaliyyətindən, xalqımız, millətimiz üçün göstərdiyi böyük və əvəzsiz tarixi xidmətlərdən danışdı, Ulu Öndəri dünya miqyaslı siyasi xadim, mahir və müdrik dövlət rəhbəri kimi səciyyələndirdi. Qeyd etdi ki, xalqımızın dahi oğlu Heydər Əliyevin müdrik siyasi kursunu onun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev uğurla davam etdirir. Konfransda ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətini əks etdirən slayd da nümayiş etdirildi.

Sonra ADPU-nun Qazax filialının baş müəllimi Gülnarə Hacıyeva və baş müəllim Hikmət Yusifov çıxış edərək ulu öndər Heydər Əliyevin müasir milli inkişaf strategiyamızın banisi olduğunu bildirdilər. Tələbələrdən Nicat Məmmədov rus dilində “Heydər Əliyev ümumxalq məhəbbətinin təzahürüdür”, Kübra Əhmədova isə ingilis dilində “Heydər Əliyev böyük tarixi şəxsiyyətidir” mövzularında maraqlı və məzmunlu çıxışlar etdilər.

Konfransda tələbə-gənclərdən Sevinc Tağıyeva və Turan Məmmədova da çıxış edərək ulu öndər Heydər Əliyevin xalqımızın tarixində misilsiz rol oynadığını, gənclərə həmişə xüsusi qayğı və diqqət göstərdiyini qeyd etdilər.

# ADPU-nun Quba filialında “İnsan alverinin mahiyyəti, doğurduğu təhlükələr və onunla mübarizə” mövzuzunda maarifləndirici tədbir keçirildi

Aprel ayının 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının akt zalında Daxili İşlər Nazirliyinin (DİN) və Təhsil Nazirliyinin (TN) tədbirlər planına əsasən “İnsan alverinin mahiyyəti, doğurduğu təhlükələr və onunla mübarizə ” mövzuzunda maarifləndirici tədbir keçirilmişdir. Tədbirdə ADPU-nun Quba filialının direktoru, professor Əli Allahverdiyev, DİN-nin İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsinin əməkdaşı, polkovnik-leytenant Fuad Əliyev, “XXI əsrin qadınları” İctimai Birliyinin (İB) sədri Mahirə Əmirhüseynova, Quba Rayon Qeyri-Hökumət Təşkilatları üzrə Resurs-Təlim Mərkəzinin sədri Eynulla Xeyrullayev, tələbə və müəllimlər iştirak etmişlər.



Tədbirdə əvvəlcə Azərbaycanın ərazi bütövlüyü uğrunda həlak olmuş şəhid soydaşlarımızın əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilmişdir.

Tədbirdə çıxış edənlər insan alveri, onun mahiyyəti, doğurduğu təhlükələr, kimlərin insan alverinin qurbanlarına çevrildiyi,uşaq alveri, risklər və həssas məqamlar, belə hadisələrin baş verdiyi təqdirdə ölkə daxilindən və xaricdən “Qaynar xətt” xidmətinə zəng edilməsinin zəruriliyi haqqında ətraflı məlumat verdilər.

Tədbirdə həmçinin məcburi əmək, məcburi əməyə cəlb edilən , belə olan vəziyyətdə təhsildən yayınan uşaqlardan, ailədə, cəmiyyətdə, məktəbəqədər təhsil müəssisələrində , iş yerlərində uşaqların zorakılığa məruz qalmasından, belə hallara qarşı birgə mübarizə aparılmasının və uşaq hüquqlarının qorunmasının vacibliyindən də söhbət açıldı.



Tədbirin sonunda DİN-nin İnsan Alverinə Qarşı Mübarizə Baş İdarəsinin əməkdaşı, polkovnik-leytenant Fuad Əliyev və “XXI əsrin qadınları” İB-nin sədri Mahirə Əmirhüseynova tələbələri maraqlandıran sualları ətraflı cavablandırmışlar.

# Azərbaycanın Milli Qəhrəmanı Həmidiov Şükür Nəriman oğluna




Bu günlərdə Qarabağda gedən döyüşlərdə xüsusi igidlik və şücaət göstərdiyinə görə Milli Ordumuzun zabiti, polkovnik Həmidiov Şükür Nəriman oğlu Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyev tərəfindən “Azərbaycanın Milli Qəhrəmanı” fəxri adına layiq görülmüşdür. Şükür Həmidiovun sağlığında hər adama qismət olmayan bu böyük adı almasını eşidəndə öncə gözlərim önünə qəhrəmanımızın atası Nəriman müəllim gəldi. Yaxşı yadımdadır, mən orta məktəbdə oxuyanda o, bizim məktəbdə dərs deyirdi. Mənə də dərs deyib. Çox qoçaq, yorulmaq bilməyən, zəhmətkeş bir insan idi. İlin doqquz ayı Başarat kəndinə dərsə, özü də bəlkə hamıdan tez gələrdi Nəriman müəllim. Yorulmaq bilməzdi bu insan. Görünür, Milli Qəhrəmanımız da qoçaqlığı, cəsurluğu, igidliyi elə birinci olaraq atasından öyrənib. “Ot kökü üstə bitər” deyiblər müdrik ata-babalarımız. Eşq olsun Milli Qəhrəmanımıza!

*Eşidəndə çox sevindim, kövrəldim,*
*Adın çox mübarək, Şükür qardaşım!*
*Qismət olsun, tezliyinən dağlara,*
*Bir yerdə biz gedək, Şükür qardaşım!*

*Mən səni görəndə lap uşaq idin,*
*Elə o zamandan çox qoçaq idin.*
*Kömək istəyənə sən dayaq idin,*
*Unutmayaq gərək, Şükür qardaşım!*

*Kəndimizdə verrəm qonaqlığını,*
*Dastana salaram qoşaqlığını.*
*Bir an da unutma sayıqlığını,*
*Öndədir gələcək, Şükür qardaşım!*

*Qorxmazlıq, igidlik kəndindən gəlir,*
*Elindən, obandan, türkündən gəlir.*
*Soyadından gəlir, kökündən gəlir,*
*Səndəki bu ürək, Şükür qardaşım!*

*Aylar dolanacaq, illər keçəcək,*
*Gələnlər gələcək, gedən gedəcək,*
*Müəllimlər səndən misal çəkəcək,*
*Dərslər keçiləcək, Şükür qardaşım!*

*Sənə çox yaraşır, general olmaq,*
*General olasan, edək kef-damaq*
*Pirə, Topağaca asasan bayraq,*
*Təbrikə biz gələk, Şükür qardaşım!*

***Xankişi Bəxtiyar***

# Filologiya fakültəsində ingilis dilində növbəti açıq dərs



Mart ayının 18-də Filologiya fakültəsində İngilis dili kafedrasının müəllimi Günay Alıyevanın “İngilis dili” fənnini tədris etdiyi I kursun 101-ci qrupunda əziz milli bayramımız olan Novruz bayramına həsr edilmiş “Novruz Holiday” (“Novruz bayramı”) mövzusunda açıq dərsi keçirilmişdir. Açıq dərsdə Filologiya fakültəsinin dekanı, filologiya üzrə elmlər doktoru,professor Buludxan Xəlilov, dekan müavini, filologiya üzrə elmlər doktoru Məhərrəm Hüseynov, İngilis dili kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva, həmin kafedranın müəllimləri Sevinc Hacıyeva, Günay Əfəndiyeva, Filologiya fakültəsinin I kurs tələbələrinin tyutoru Sahilə İbrahimova, həmçinin 102-ci və 103-cü qrupların tələbələri iştirak edirdilər.

Müəllim Günay Alıyeva iştirakçıları və qonaqları salamlayaraq sözü tələbələrə verdi. Tələbələr bayram süfrəsi bəzəyərək və başlarına gül çələngləri taxaraq əsl bayram ab-havası yaratmışdılar. Hər bir tələbə danışdığı mövzunu təqdim etdi. 101-ci qrup tələbələri Şəfiqə Babayeva “History of Novruz holiday”(“Novruz bayramının tarixi”), Aynisə Əhmədova “Traditions of Novruz holiday”(“Novruz bayramının ənənələri”), Aytac Cabbarlı “Samani”(“Səməni”), Fatimə Əliyeva “Kosa and Kechal”(“Kosa və Keçəl”), Ayişə Həsənova “Water Tuesday”(“Su çərşənbəsi”), Saraxanım Qarayeva “Fire Tuesday”(“Od çərşənbəsi”), Nərmin Babayeva “Wind Tuesday”(“Külək çərşənbəsi”), Vəfa Abuşova “Earth Tuesday” (“Torpaq çərşənbəsi”), Səbinə Abbasova “Shakarbura”(“Şəkərbura”), Nübar Qafarova “Pakhlava”(“Paxlava”),Gülay İdrisli “Goghal”(“Qoğal”), Arzu Qaracayeva “Coloured Eggs”(“Rəngli yumurtalar”), Aysel Babayeva “Pilaf”(“Plov”) mövzularında danışdılar.

Açıq dərsin sonunda müəllimə G.Alıyeva tələbələrə öz təşəkkürünü bildirdi. Sonra isə açıq dərsin gedişini izləyən İngilis dili kafedrasının müəllimləri S.Hacıyeva və G.Əfəndiyeva öz fikirlərini bildirdilər. Filologiya fakültəsinin dekanı,professor B.Xəlilov isə tələbələrin açıq dərs zamanı ingilis dilində səlis və aydın danışmalarını, əyanı vəsaitlərdən istifadə etmələrini təqdirəlayiq hal kimi alqışladı. İngilis dili kafedrasının müdiri, dosent G.Alıyeva açıq dərsi yüksək qiymətləndirərək tələbələrin ingilis dili üzrə bilik və bacarıqlarının, ünsiyyət vərdişlərinin artırılması cəhətdən əhəmiyyətini vurğuladı, müəllimə və tələbələrə uğurlar arzuladı.

**Sevinc Hacıyeva,**
**Günay Əfəndiyeva,**
**İngilis dili kafedrasının müəllimləri**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Iqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının müəllimi Nəcibə Axundovaya həyat yoldaşı

**Sənan Axundovun**

Azərbaycanın ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə həlak olmasından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Safura İbrahimovaya bacısı

**Tamila Əhmədovanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyazi analiz kafedrasının dosenti

**Cəfər Süleymanovun**

vəfatından kədərləndiyini bildirir,mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Elmi kitabxananın elmi-texniki informasiya şöbəsinin müdiri Arifə Məhəddinovaya qardaşı

**Şəfaqətin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1336
Sayı: 1500
Çapa imzalanıb: 29.04.2016-cı il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.